**yet kazanarak başına geçerse, ekseriyet teşkil etmeyen ve ancak yüzde otuzu hakikî Türk olan ve yüzde yetmişi başka unsurlardan olanlar, hem hakikî Türklerin, hem hâkimiyet-i İslâmiyenin** (İslam hakimiyyətinin) **aleyhine cephe almaya mecbur olacaklar. Çünkü, İslâmiyetin bir kanun-u esasîsi** (əsas qanunu) **olan bu âyet-i kerime,** وَلاَ تَـزِرُ وَازِرَةٌ وِزْرَ اُخْـرٰي **'dır. Yani, "Birisinin günahıyla başkası muahaze** (mühakimə edilməz) **ve mes'ul olmaz."**

**Halbuki, ırkçılık damarıyla, bir adamın cinayetiyle mâsum bir kardeşini, belki de akrabasını, belki de aşiretinin efradını öldürmekte, kendini haklı zanneder. O vakit, hakikî adalet yapılmadığı gibi, şiddetli bir zulüm de yol bulur. Çünkü *"Bir mâsumun hakkı, yüz câniye*** (cinayətkara) ***feda edilmez"* diye, İslâmiyetin bir kanun-u esasîsidir** (əsas qanunudur).

**Bu ise, çok ehemmiyetli bir mesele-i vataniyedir** (vətənə dair bir məsələdir). **Ve hâkimiyet-i İslâmiyeye** (İslam hakimiyyətinə)**, büyük bir tehlikedir.**

**Mâdem hakikat budur, ey dindar ve dine hürmetkâr Demokratlar, siz, bu iki partinin gayet kuvvetli ve zevkli ve câzibedar** (cazibəli) **nokta-i istinadlarına** (istinad nöqələrinə) **mukabil** (qarşılıq), **daha ziyade maddî ve mânevî cazibedar nokta-i istinad** (istinad nöqtəsi) **olan hakaik-i İslâmiyeyi** (İslam həqiqətini)**, nokta-i istinad yapmaya** (istinad nöqtəsi qılmağa) **mecbursunuz.**

**Yoksa, sizin yapmadığınız eskiden beri cinayetleri, nasıl eski partiye yüklüyorlarsa, size de yükleyip, Halkçılar, ırkçılığı elde edip tam sizi mağlûp etmeye bir ihtimal-i kavî** (qüvvətli ehtimal) **ile hissettim. Ve İslâmiyet namına telâş ediyorum.**

**Hâşiye: Eskilerin lüzumsuz keyfî kanunları ve su-i istimalleri**

**neticesiyle, belki de tahrikleriyle zuhur eden Ticanî meselesini ve ağır cezalarını dindar Demokratlara yüklememek ve âlem-i İslâm nazarında Demokratları düşürmemenin çare-i yegânesi** (yeganə çarəsi)**, kendimce böyle düşünüyorum:**

**Nasıl ezan-ı Muhammediyenin (a.s.m.) neşriyle, Demokratlar on derece kuvvet bulduğu gibi, öyle de, Ayasofya'yı da beş yüz sene devam eden vaziyet-i kudsiyesine** (müqəddəs vəziyyətinə) **çevirmektir. Ve âlem-i İslâmda** (İslam aləmində) **çok hüsn-ü tesir yapan** (çox gözəl təsir buraxan) **ve bu vatan ahalisine âlem-i İslâmın hüsn-ü teveccühünü** (İslam aləminin gözəl təvəccühünü) **kazandıran, bu yirmi sene mahkemeler, bir muzır** (zərərli) **cihetini bulamadıkları; ve beş mahkeme de beraatine karar verdikleri Risale-i Nur'un resmen serbestiyetini, dindar Demokratlar ilân etmelidirler. Tâ, bu yaraya bir merhem vurmalı. O vakit âlem-i İslâmın** (İslam aləminin) **teveccühünü kazandıkları gibi, başkalarının zâlimane kabahati de, onlara yüklenmez fikrindeyim.**

**Dindar Demokratlar, hususan Adnan Menderes gibi zatların hatırları için, otuz beş seneden beri terk ettiğim siyasete, bir-iki gün baktım ve bunu yazdım.** [1]

.............................................................................................

## Şərhi:

**(Kalbe ihtar edilen içtimaî hayatımıza ait bir hakikat**

**Bu vatanda şimdilik dört parti var:**

**~ Biri Halk Partisi;**

**~ Biri Demokrat;**

---

1 (Emirdağ Lahikası - ll, 98-ci Məktub, s. 143-144)

**~ Biri Millet;**

**~ Diğeri İttihad-ı İslâmdır.**

**İttihad-ı İslâm Partisi, yüzde altmış, yetmişi tam mütedeyyin olmak şartıyla, şimdiki siyaset başına geçebilir.)**

İttihad-i İslam Partiyası›nın, Milli Məclisdə, İslam lehində qərarlar ala bilməsi və özünü qoruya bilməsi üçün, o partiyaya daxil olanların, 70%-nin sağlam Müsəlman olması lazım gəlirdi.

Demək ki, bu xüsus, o günki partiya ilə əlaqəli bir şərt idi; İslam hüququnun seçim sistemilə əlaqəli bir şərt deyildir. Necə ki, Ustad Nursi (rahmətullahi aleyh) də, bunu, ***"şimdiki siyaset"*** qeydilə ifadə etmişdir.

Ustadın yuxarıdakı cümlələrinin doğru başa düşülə bilməsi üçün, xəyalən o zamana getmək lazımdır. O zamanda, 4 siyasi partiya mövcud idi. İqtidara gələn din-dar partiyanın, Milli Məclisdə, İslam lehinə qərarlar ala bilməsi üçün, o partiyanın 70%-nin İslama tərəfdar tam dindar olması lazım idi. Bu 70% məsələsi, əsla və əsla, dini və şəri bir ölçü deyildir. Əksinə, o vaxtki partiya ilə əlaqəli bir şərt idi. Yoxsa, İslam hüququna görə, *"İlahi əhkamın həyatın hər sahəsində hakim ola bilməsi üçün, xalqın 70%-nin tam dindar olması lazımdır."* deyə, bir şərt yoxdur.

**(Dini siyasete âlet etmemeye, belki siyaseti dine âlet etmeye çalışabilir. Fakat çok zamandan beri terbiye-i İslâmiye zedelenmesiyle; ve şimdiki siyasetin cinayetine karşı dini siyasete âlet etmeye mecbur olacağından...)**

Ustad Said Nursi (rahmətullahi aleyh), bu cümlələrində, dində siyasət və partiyaçılıq olmadığını ifadə etməkdədir. Çünki İttihad-ı İslam Partiyası'nın İslama xidmət edə bilməsi üçün, o partiyaya girənlərin 70%-nin tam dindar olması lazım gəlirdi. Əks təqdirdə, bu

partiya, dinin bəzi məsələlərində güzəştə getməyə məcbur qalacaqdı. İslami tərbiyə isə, uzun müddətdən bəri zədələndiyi üçün, o partiya mənsubu millət vəkillərinin 70%-nin tam dindar olması da, mümkün deyildi.

Demək, bu partiya, bu cəhətdən müvəffəq ola bilməyəcəyindən dolayı, siyasəti dinə deyil; əksinə, dini, siyasətə alət etmək və dində güzəştə getmək məcburiyyətində qalacaqdı. Bu isə, doğru deyildir. Bundan dolayı, Ustad Nursi, partiyaçılıq sistemi ilə dinə xidmət edilə bilməyəcəyini ifadə etmişdir.

Bəzilərinin zənn etdiyi kimi, Ustad Nursi, bu məktubunda, İttihad-ı İslam Partiyası'nın başa keçməsini istəmədiyi mənasında deyildir. Ustad, sanki Demokratlara belə deyir, *"Madam ki, siz, iqtidarsınız; elə isə, sizlər, Quranı hakim qılın. İttihad-ı İslam Partiyası'nın iqtidara gəlməsinə fürsət vermədən, dərhal İslam həqiqətlərinə istinad edin. Çünki İttihad-ı İslam Partiyası'nın qazanması halında, o partiya mənsublarının da 70%-nin tam dindar olması mümkün olmayacağı üçün, dini, siyasətə alət edərlər və İslamın hakim olması gecikə bilər. Bu da, İslam üçün zərərdir."*

Məzkur (yuxarıda zikr edilən) cümlələrdə, Ustad Nursi'nin, İttihad-ı İslam Partiyası'nı rədd etdiyi; Demokrat Partiyasını isə, dəstəklədiyi mənası anlaşılmamaqdadır. Əgər İttihad-ı İslam Partiyası başda olsaydı, onlara da eyni şeyi söyləyəcəkdi.

Ustadın, heç bir siyasi partiya ilə münasibəti yoxdur və heç bir siyasi partiyanı da dəstəkləməmişdir. Çünki əcnəbi diyarından gətirilən bu günki partiyaçılıq sistemilə dinə xidmət etmək, caiz deyildir və bu yolla müvəffəqiyyət əldə etmək də, mümkün deyildir. Çünki:

**1.** Avropadan gətirildiyi üçün, müsbət deyildir, mənfidir. Mənfi olduğu üçün, milləti, təfriqəyə (ayrılıqlara) sövq edər. Avropa, İslam alə-

mini parçalayıb məğlub etmək üçün, siyasət deyilən bu fransız xəstəliyini içimizə atmışdır.

**2.** Quran və Sünnətə görə, şəxslərin özlərini namizəd göstərmələri, caiz deyildir. Çünki qürura, təzkiyə-i nəfsə (özünü təmizə çıxarmağa) və təfriqəyə səbəbdir. Bu mövzuda, Haqq Taala, əzəmətli kitabında belə buyurmaqdadır: فَلَا تُزَكُّوٓا۟ أَنفُسَكُمْ..

***"...Özünüzü təmizə çıxartmayın!"***(1)

Allah rəsulu (sallallahu aleyhi və səlləm) də, bir hədisində, belə buyurmaqdadır:

***"Biz, bir vəzifəni, onu tələb edənə və hərisliklə istəyənə verməik."***(2) **(Haşiyə):**

**3.** Əhil olmayanlar işə qarışdığı üçün, öz istək və arzularına görə, dini, siyasətə alət edərlər. Əhil olmayanların şəri bir idarənin başına keçməsi isə, caiz deyildir.

**4.** İslama görə, şəri əhkamı tətbiq edəcək dövlət idarəçisinin seçimində, alimlər və insanlar içərisində mötəbər bir camaatın rəyi məqbuldur. Bu şəxslərin xaricindəkilərin rəyləri məqbul olmadığı halda, indiki bəşəri seçim sistemində, hər kəsin rəyinə müraciət edildiyindən, İslama uyğun deyildir. **(Haşiyə)**

**5.** Partiyaçılıq sistemi, əcnəbilərdən gəldiyi və onların üsulunda olduğu üçün, onları bir növ qəbullanmaq hökmündədir. Çünki əcnəbilə-

---

1 (Nəcm/32)

2 (Buxari, hədis no: 7149)

**(Haşiyə)** Bu və bənzəri hədislərin şərhi, bu məktubun sonunda gələcəkdir.

**(Haşiyə)** Bu məktubun sonunda, İslamda dövlət başçısının necə təyin edilməsinə toxunacağıq.

rin qəbul etdikləri şərtlər altında, ancaq partiyalar qurula bilər.

Deməl, siyayət aləminin cilovu, bu an üçün, əcnəbilərin əlində olduğundan, bu günki siyasətlə dinə xidmət edilməz.

**6.** Partiyaçılıq mənfi olduğu üçün, إِنَّمَا ٱلْمُؤْمِنُونَ إِخْوَةٌ / ***“Möminlər, yalnız qardaşdırlar.”***[1] ayətinin əmr etdiyi uxuvvəti (qardaşlığı) pozduğundan və təfriqəyə səbəb olduğundan, caiz deyildir.

**7.** Quranın nassı ilə, insanlar, 2 firqədirlər: Ya mömin, ya da kafir. Üçüncü bir firqə yoxdur.

Mətndə keçən ***“terbiyye-i İslamiyyenin zedelenmesi”*** ilə əlaqəli olaraq, Ustad Nursi’nin belə bir məktubu vardır:

*“Kendi Kendime Hasbihal (dərdləşmək)” namındaki parçaya lâhika (əlavə) olarak*

*Adliye Vekiliyle ve Risale-i Nur’la alâkadar mahkemelerin hakimleriyle bir hasbihaldir (dərdləşməkdir).*

*Efendiler! Siz, niçin sebepsiz bizimle ve Risale-i Nur’la uğraşıyorsunuz? Kat’iyen size haber veriyorum ki:*

*Ben ve Risale-i Nur, sizinle değil mübareze, belki sizi düşünmek dahi, vazifemizin haricindedir. Çünkü, Risale-i Nur ve hakiki şakirtleri:*

*~ elli sene sonra gelen nesl-i âtiye (gələcək nəslə), gayet büyük bir hizmet; ve*

*~ onları büyük bir vartadan (təhlükədən) ve millet ve vatanı büyük bir tehlikeden kurtarmaya çalışıyorlar.*

*Şimdi bizimle uğraşanlar, o zaman kabirde elbette toprak oluyorlar. Farz-ı muhal olarak (imkansız olsa da, fərz edək ki), o saadet ve selâ-*

1 (Hucurat/10)

*met hizmeti, bir mübareze olsa da, kabirde toprak olmaya yüz tutanları, alâkadar etmemek gerektir.*

*Evet, Hürriyetçilerin ahlâk-ı içtimaiyede (ictimai əxlaqda) ve dinde ve seciye-i milliyede (milli xarakterdə) bir derece lâubalilik (hörmətsizlik, laqeydlik) göstermeleriyle; yirmi-otuz sene sonra, dince, ahlâkça, namusça şimdiki vaziyeti gösterdiği cihetinden, şimdiki vaziyette de, elli sene sonra bu dindar, namuskâr, kahraman seciyeli (xarakterli) milletin nesl-i âtisi (gələcək nəsli), seciye-i diniye (dini xarakter, əxlaq) ve ahlâk-ı içtimaiye (ictimai əxlaq) cihetinde ne şekle girecek, elbette anlıyorsunuz.*

*Bin seneden beri, bu fedakâr millet, bütün ruh'u-canıyla, Kur'ân'ın hizmetinde emsalsiz (misilsiz) kahramanlık gösterdikleri halde, elli sene sonra o parlak mâzisini (keçmişini) dehşetli lekedar, belki mahvedecek bir kısım nesl-i âtinin (gələcək nəslin) eline, elbette Risale-i Nur gibi bir hakikati verip, o dehşetli sukuttan (mənəvi çöküşdən) kurtarmak, en büyük bir vazife-i milliye ve vataniye (vətən və millətə aid bir vəzifə) bildiğimizden, bu zamanın insanlarını değil, o zamanın insanlarını düşünüyoruz.*

*Evet, efendiler! Gerçi Risale-i Nur, sırf âhirete bakar; gayesi Rıza-yı İlâhî (Allahın rizası) ve imanı kurtarmak ve şakirtlerinin ise, kendilerini ve vatandaşlarını idam-ı ebedîden (əbədi yoxluqdan) ve ebedî haps-i münferitten (həbsdən) kurtarmaya çalışmaktır. Fakat dünyaya ait ikinci derecede gayet ehemmiyetli bir hizmettir; ve bu millet ve vatanı anarşilik tehlikesinden ve nesl-i âtinin (gələcək nəslin) biçareler kısmını dalâlet-i mutlakadan (mütləq dəlalət, azğınlıqdan) kurtarmaktır. Çünkü bir Müslüman başkasına benzemez. Dini terk edip İslâmiyet seciyesinden (əxlaqından) çıkan bir Müslim, dalâlet-i mutlakaya (mütləq dəlalətə) düşer, anarşist olur, daha idare edilmez.*

*Evet, eski terbiye-i İslâmiyeyi (İslam tərbiyyəsini) alanların yüzde ellisi meydanda varken ve an'anât-ı milliye ve İslâmiyeye (İslami və milli ənənəyə) karşı yüzde elli lâkaytlık gösterildiği halde, elli sene sonra yüzde doksanı nefs-i emmâreye (pisliyi əmr edən nəfsə) tâbi olup, millet ve vatanı anarşiliğe sevk etmek ihtimalinin düşünülmesi ve o belâya karşı bir çare taharrisi (axtarışı), yirmi sene evvel beni siyasetten ve bu asırdaki insanlarla uğraşmaktan kat'iyen menettiği gibi; Risale-i Nur'u, hem şakirtlerini, bu zamana karşı alâkalarını kesmiş; hiç onlarla ne mübareze, ne meşguliyet yok.*

*Madem hakikat budur; adliyelerin, değil beni ve onları ittiham etmek, belki Risale-i Nur'u ve şakirtlerini himaye etmek, en birinci vazifeleridir. Çünkü, onlar bu millet ve vatanın en büyük bir hukukunu muhafaza ettiklerinden, onların karşısında, bu millet ve vatanın hakikî düşmanları Risale-i Nur'a hücum edip, adliyeyi şaşırtıp, dehşetli bir haksızlığa ve adaletsizliğe sevk ediyorlar."*[1]

Demək, Ustad Nursi (rahmətullahi aleyh)'in məktubda dedikləri də göstərir ki, gələcəkdə fəsadlar daha çox olacaqdır. Ustad, bunu xəbər vermiş və xəbər verdiyi kimi də baş vermişdir.

Bu halda, İlahi əhkamın həyatın hər sahəsində hakim olması xüsusu, xalqın iradəsinə buraxılsa, heç bir vaxt, şəri əhkam hakim olmayacaqdır. Elə isə, Ustad, Adnan Menderesə, sanki belə demiş olur:

*"Allahın sənə verdiyi bu fürsəti dəyərləndir. Yeni bir seçimə getmədən, xalqın rəyinə müraciət etmədən, dərhal, Allahın hökmlərini hakim qıl. Quranın adil qanunlarının icrasını və İslamın gözəlliyini görən xalq, zamanla İslam tərbiyyəsini əldə edəcəkdir."*

**(Şimdilik, o parti başına geçmemek lazımdır.)**

---

1 (Emirdağ Lahikası - l, 7-ci Məktub, s. 21-22)

Yəni, İttihad-ı İslam Partiyası'nın o günki şərtlərdə, dini, siyasətə alət etmədən xidmət edə bilməyəcəyini bilən Ustad, o zaman, tək başı ilə iqtidarda olan Demokrat Partiyası mənsublarına, xüsusilə Adnan Menderes'ə deyir ki:

*"Siz, iqtidara gəldiniz. Əgər siz, Qurana xidmət etsəniz, bu nemətin şükrünü əda etmiş olarsınız. Əgər Allahın əmr etdiyi tərzdə o neməti istifadə etməzsəniz, nankorluq etmiş olarsınız və o nemət, sizin haqqınızda cəza və bəla olar."*

Mətndə keçən ***"şimdilik"*** təbiri ilə, o zamankı seçim sistemi nəzərə verilib, o zamanda İttihad-ı İslam Partiyası'nın, dini, siyasətə alət etmədən, başa keçə bilməyəcəyi ifadə edilir.

Bu xüsus, bir həqiqətdir ki, Ustad Nursi (rahmətullahi aleyh), Demokratlara yazdığı məktublarında, onları əsla mədh etməmişdir. İqtidarda olduqları üçün, güclü olmalarından dolayı, sadəcə Quran naminə onlara təbliğ etmişdir. Çünki iqtidarda olmaları səbəbilə, məsuliyyət, o anda onlardadır. Digər partiyalar, iqtidarda olmadıqları üçün məsul olmadıqlarından, o zaman onlara təbliğ etməmişdir. Bununla bərabər, Ustad, Xalq Partiyası iqtidarda olduğu dövrlərdə də, Quran naminə onlara da təbliğ etmişdir. Necə ki, CHP baş katibi Hilmi bəyə yazdığı məktubu, yuxarıda nəql etdik. Ustad, Demokratlara belə deyir:

*"İslam həqiqətlərini həyatın hər sahəsində hakim qılmaq vəzifəsini yerinə yetirməzsəniz, məsuliyyəti siz çəkərsiniz. O vaxt, Allahın və qulların haqqı sizdən soruşulacaq."*

**(Halk Partisi ise: Hakikaten acib ve zevkli bir rüşvet-i umumiyi...)**

Yəni, *Xalq Partiyası isə: Həqiqətən qəribə və zövqlü bir hakimiyyət, bir ağalıq, bir idarəçilik və bunlardan gələn istibdadı*, **(kanunlar)** yəni, *Allahın hökmlərinə istinad etməyən və tamamilə zülmə əlverişli olan bəşəri qanunlar* **(perdesinde bazı memurlara verdikleri için,)**

yəni, *Xalq Partiyası mənsubları, İlahi əhkama müxalif elə qanunlar hazırlayırlar ki, o qanunlar, ədaləti deyil, istibdadı və zülmü nəticə verir. O idarəçilər və ağalar, o qanunlara istinad edib xalqa zülm edirlər və -Ustadın ifadəsilə-, o zülmlə, özlərini bir növ Nəmrud və Firon kimi təsəvvür edirlər.*

Bax Xalq Partiyası, Ustadın ifadəsilə, İlahi əhkama istinad etməyən qanunlar pərdəsi altında belə bir rüşvəti (yəni hakimiyyət, ağalıq, idarəçilik və bunlardan gələn istibdadı) məmurlara verdiyi üçün, iqtidara gəldiyi gündən o günə qədərki **(yirmi sekiz senelik bütün cinayatıyla),** gərək o partiyanın qanunlar pərdəsi altında etmiş olduğu haqsız zülm və istibdadı ilə; gərəksə də Xalq Partiyası›ndan olmayan **(başkaların)** etdikləri **(cinayatı)** cinayətlər də onlara yüklənir. Çünki Xalq Partiyası, o gün iqtidarda olduğundan dolayı, əlində səlahiyyət olduğu halda, o cinayətlərə əngəl olmadığı **(ve İttihadcıların ve mason kısmının seyyiatları da o partiye)** yəni, *Xalq Partiyasına* **(yükletildiği halde, Demokratlara bir cihette galib hükmündedirler. Çünkü ubudiyyetin noksaniyyetiyle enaniyyet kuvvet bulur, nemrudçuluklar çoğalır.)**

Ustad Nursi'nin bu ifadəsilə, Xalq Partiyası mənsubları, İlahi əhkama istinad etməyib bəşəri qanunlara istinad etdikləri üçün, eqoları qüvvət qazanır; və onlar, bir növ Nəmrud və Firon olurlar. Necə ki, Nəmrud və Firon, Allahın əhkamına istinad etmədikləri üçün, ədaləti təmin edə bilməmiş; qəzəb qüvvələrinin məhsulu olan qanunlarla xalqa zülm etmişlərdi.

Eynilə bunun kimi, Ustad Said Nursi (rahmətullahi aleyh) onlara deyir ki:

*"Xalq Partiyası, bəşəri qanunlar pərdəsi altında, məmurlarını bir növ fironlaşdırmış və bu hal, onları zülm və istibdada sövq etmişdir. Çünki ədalət, ancaq Allahın hökmlərilə təmin edilə bilər. Bəşəri qa-*

*nunlar, ədaləti təmin etməkdən fərsəx-fərsəx uzaqdır.”*

Gələcək ayət, hökm vermə səlahiyyətinin, yalnız Allaha aid olduğunu belə bildirir:

أَفَحُكْمَ ٱلْجَٰهِلِيَّةِ يَبْغُونَ ۚ وَمَنْ أَحْسَنُ مِنَ ٱللَّهِ حُكْمًا لِّقَوْمٍ يُوقِنُونَ

*«Onlar cahiliyyə dövrünün hökmünümü istəyirlər? Qəti inanan bir camaat üçün Allahdan daha yaxşı hökm verən kim ola bilər?»*[1]

**(Bu benlik zamanında,)** yəni, İlahi əhkamın qaldırılıb yerinə bəşəri qanunların təsis edildiyi bir zamanda, **(me’muriyyet, hakikatta)** yəni, *məmurluq, əslində, Kitab və sünnətə görə, İslam dini və bu din ətrafında toplanan Müsəlmanlara* **(bir hizmetkarlık olduğu halde; bir hakimiyyet, bir ağalık, bir nemrudçuluk ile, nefse gayet zevkli bir hakimiyyet mertebesini)** yəni, *bir xidmət olduğu halda, bir hakimiyyət, bir ağalıq, bir nəmrudluq ilə, nəfsə çox zövqlü gələn bir hakimiyyət mərtəbəsini, Xalq Partiyası,* **(bir kısım memurlara rüşvet olarak verdiği)** yəni, *bir qisim məmurlara rüşvət olaraq verdiyi və bunu felən yerləşdirdiyi* **(için, bütün o acib cinayetlerle ve kendinden olmayan)** yəni, *bütün o cinayətlərlə və özündən olmayan, yəni Xalq Partiyasına müxalif olan* **(ceridelerin neşriyatıyla)** yəni, *o qəzetlərin Xalq Partiyası əleyhində çalışmalarıyla* **(beraber bana yapılan muamelelerinden),** yəni *onları haqqa dəvət etdiyim halda, haqqı qəbul etməyib məni sürgün etmələrindən və həbsə atmalarından* **(hissettim ki;)** *bunların etdikləri fironluqdur və bundan dolayı* **(bir cihette manen Demokratlara galib geliyorlar.)** Çünki Nəmrud və Firon kimi İlahi əhkamı qəbul etməyib, bəşəri qanunlara istinad etdiklərindən; ənaniyyətdən (eqodan) gələn bir qüvvətlə, Demokratlar üzərində mənən qələbə çalırlar. Xalq Partiyası, bu qanunlar pərdəsi altında edilən istibdadla ayaqda durur. Nə vaxt fironluqları qırılsa, o vaxt, Xalq Partiyası dağılmağa məhkum

1 (Maidə/50)

olacaq. Ustad Nursi (rahmətullahi aleyh), mənən Demokratlara deyir ki:

*"Hər nə qədər sizlər iqtidarda olsanız belə, Xalq Partiyasının ihdas etdiyi qanunları, eynilə tətbiq və icra etməklə, onların yolunu izləmiş olursunuz və mənən onlara dəstək verirsiniz. O halda, Xalq Partiyası, qanunlar pərdəsi altında cazibədar və zövqlü olan hakimiyyət, ağalıq, idarəçilik və bunlardan doğan bir istibdadı, ümumi rüşvət olaraq məmurlarına verməsinə; və bununla onları "kiçik fironlar, nəmrudlar" halına gətirməsinə qarşılıq; sizlər, İlahi əhkamı hakim qılın. Həm özünüz o əhkamı tətbiq və icra etməklə, fironluqdan qurtulun və mənliyinizi bir tərəfə buraxıb Allaha qulluğunuzu elan edin. Beləcə, zülmdən və istibdaddan qurtulun. Həm də rəiyyətinizi İlahi əhkama itaət etdirməklə, onları qula qul olmaqdan qurtarıb, bir tək Allaha qul olmağa dəvət edin. Ancaq bu şəkildə, Xalq Partiyasına qələbə çala bilərsiniz. Onların qanunlarını tətbiq etməklə, onlara qələbə çalmağınız, mümkün deyildir. Ancaq İlahi əhkamı tətbiq etməklə onlara qalib gələ bilərsiniz."*

Demokratlar isə, bu nöqtədə, Ustadın tövsiyyələrini dinləmədilər və İlahi əhkamı tətbiq etmədilər.

Bəli, Cumhuriyyət Xalq Partiyası, qanunlar pərdəsi altında, bəzi məmurlara hakimiyyət verməklə, onları özlərinə tərəfdar etmiş; və o məmurlar, o qanunlar pərdəsi altında, özlərini bir növ Fironlar, Nəmrudlar təsəvvür etməklə, xalqa zülm etmişdilər. Xalq Partiyası, 28 il, yəni partiyanın iqtidara gəldiyi ilk günlərdən etibarən, millətə zülm etmiş; insanları diyarlarından sürgün etmiş; Müsəlmanların bir qismini edam etmiş; məscidləri bağlatmış; mədrəsələri ortadan qaldırmış; xalqı ağır vergilərə bağlamış və xalqın malına əl qoymuşdur.

Bunlar kimi, 28 illik cinayətilə bərabər, başqalarının cinayətlərinə, xüsusilə, İttihadçıların və masonların pis əməllərinə də şərik olmuşlar-

dır. Çünki onlar, iqtidarda olmaları səbəbilə, başqalarının cinayətlərinə və pis əməllərinə əngəl olmaları lazım gəldiyi halda, buna əngəl olmamışdılar. Beləcə, həm özlərinin, həm də başqalarının cinayət və pis əməllərini də yüklənmişlərdir. Həm Ustad Nursi, onları haqqa dəvət etdiyi halda, onlar haqqı qəbul etməkdən üz çevirib Ustadı sürgün etmiş və həbsə atmışdılar.

Xalq Partiyası, bu qədər hədsiz zülm, istibdad, cinayət və pis əməllər işləyib haqqı qəbul etməkdən boyun qaçırdıqları halda, yenə Demokratlara mənən qalib hökmündədirlər. Bunun səbəbi, İlahi qanunlara deyil, əksinə öz mənliklərindən doğan bəşəri qanunlara istinad etmələri səbəbilə, özlərində bir qüvvət tapıb, şəxsiyyətlərini bir növ Nəmrud və Firon təsəvvür edərək, xalqa zülm etmələri və istibdad tətbiq etmələridir. Demokratlar isə, eynilə o qanunları təsvib etdilər (uyğun, münasib gördülər) və Xalq Partiyası'nın icraatlarını da dəstəklədilər.

Dolayısı ilə, Ustadın tövsiyyəsi olan -həyatın hər sahəsində, İlahi əhkamı hakim qılma-dıqlarından, Qurana deyil, mənliklərinə istinad etdiklərindən, eynilə onlar kimi oldular.

**Xülasə:** Ustadın ifadəsilə, bəşəri qanunlar, Qurana istinad etmədiyi, əksinə bəşərin qəzəb qüvvəsinin məhsulu olduğu üçün, nəmrudlar və fironlar yetişdirir. O qanunlar, nə vaxt ki, səmavi vəhyə, yəni Quran və Sünnətə istinad etsə, o vaxt ədalət təmin edilmiş olar; yoxsa bir istibdad, böyük bir zülm meydana gələr. Bu xüsusda, Ustad Nursi'nin yazdığı ***30-cu Söz*** olan ***"Ene risalesi"***nə müraciət edilsin.

Demək, Ustadın açıq ifadəsilə, İlahi əhkama tərəfdar olub tətbiq və icra etməyənlər, kiçik nəmrudlar, fironlar hökmündədirlər.

Ustad Said Nursi (rahmətullahi aleyh), məmurluğun həqiqi mənasını isə, belə izah edir:

**(Halbuki, İslâmiyetin bir kanun-u esasîsi olan, hadis-i şerifte سَــيِّدُ الْقَــوْمِ خَادِمُهُــمْ yani, "Memuriyet, emirlik ise, reislik değil, millete bir hizmetkârlıktır.")**

Bu cümlədə keçən ***"millet"*** təbirindən murad, İslam həqiqətləri və şəriət ətrafında toplanan Müsəlmanlar deməkdir. Çünki Qurana görə, ***"din"*** ilə ***"millət"*** kəlimələri, həqiqi mənaları etibarı ilə birdir; lakin aralarında etibari bəzi fərqliliklər mövcuddur. Ustad Nursi (rahiməhullah), bu mövzuda belə deyir:

*"Biz Müslümanlar indimizde ve yanımızda, din ve milliyet, bizzat müttehiddir (birləşmişdir). İtibarî, zahirî, ârızî bir ayrılık var. Belki din, milliyetin hayatı ve ruhudur. İkisine birbirinden ayrı ve farklı bakıldığı zaman, hamiyet-i diniye (dində irəli olma halı, din üçün çalışma), avam ve havassa (seçkinlər sinfinə) şâmil oluyor."*[1]

***"Din",*** İlahi qanunlar mənzuməsidir. ***"Millət"*** isə, o İlahi qanunlar ətrafında toplanan Müsəlmanlara deyilir. Bu nöqtədə, bəzən millət, din mənasında da istifadə edilməkdədir. Məsələn, Haqq Taala, belə buyurmaqdadır:

فَٱتَّبِعُواْ مِلَّةَ إِبْرَٰهِيمَ حَنِيفًۭا

*"İbrahimin hənif millətinə (dininə) tabe olun."*[2]

Bu ayətin sarih/açıq mənasınca, "millət" ilə "din" kəlimələri, eyni mənadadır. Necə ki, Ustad Nursi, *"Milletimiz de, yalnız İslamiyyettir."*[3] deməklə, bu xüsusu izah etmişdir.

---

1 (Hutbe-i Şamiye, s. 64)

2 (Al-i İmran/95)

3 (Hutbe-i Şamiye, s. 93)

O halda, Ustadın, ***“Memuriyyet, emirlik ise, reislik değil; millete bir hizmetkarlıktır.”*** ifadəsindən murad, -əsla- bu günki qanunlarla xalqa xidmət etmək deyildir. Əksinə, İslama və o din ətrafında bir araya gələn Müsəlmanlara xidmətdir.

**(Demokratlık, hürriyet-i vicdan , İslâmiyetin bu kanun-u esasîsine dayanabilir.)**

*“Risale-i Nuru, yenə Risale-i Nurla izah etmək lazımdır.”* düsturundan dolayı, ***“hürriyyet”*** kəliməsinin izahını, Ustad Nursi›dən dinləyək:

*“Hürriyet budur ki: Kanun-u adalet ve tedipten (ədalət və cəza qanunundan) başka, hiç kimse kimseye tahakküm etmesin (zorla hökm etməsin). Herkesin hukuku mahfuz (qorunmuş) kalsın, herkes harekât-ı meşruasında (məşru, şəriətin icazə verdiyi hərəkətlərində) şâhâne (şah kimi) serbest olsun.*

لاَيَجْعَلْ بَعْضُكُمْ بَعْضًا اَرْبَابًا مِنْ دُونِ اللهِ

*‘Allahı qoyub bir-birimizi ilahiləşdirməyək.’* [1] *nehyinin (qadağasının) sırrına mazhar (bir şeyin zahir olduğu yer) olsun.”*[2]

*“Asya kıt’asının ve istikbalinin (gələcəyinin) keşşafı (ortaya çıxaranı) ve miftahı (açarı), şûrâdır. Yani, nasıl fertler birbiriyle meşveret eder; taifeler, kıt’alar dahi o şûrâyı yapmaları lâzımdır ki, üç yüz, belki dört yüz milyon İslâmın ayaklarına konulmuş çeşit-çeşit istibdatların kayıtlarını, zincirlerini açacak, dağıtacak, meşveret-i şer’iye (şəri məşvərət) ile şehamet (cəsarət) ve şefkat-i imaniyeden tevellüd eden (imandan gələn şəfqətdən doğan) hürriyet-i şer’iyedir (şəri azadlıqdır) ki, o hürriyet-i şer’iye (o şəri azadlıq), âdâb-ı şer’iye (şəriətin ədəbi) ile süslenip, garp medeniyet-i sefihanesindeki seyyiatı (qərbin səfeh*

1 (Al-i İmran/64)

2 (Münazarat, s. 21

*mədəniyyətindəki pislikləri) atmaktır.*

*İmandan gelen hürriyet-i şer›iye* (şəri azadlıq), *iki esası emreder:*

اَنْ لاَ يُذَلِّلَ وَلاَ يَتَذَلَّلَ مَنْ كَانَ عَبْدًا لِلّٰهِ لاَ يَكُونُ عَبْدًا لِلْعِبَادِ لاَ يَجْعَلْ بَعْضُكُمْ بَعْضًا اَرْبَابًا مِنْ دُونِ اللهِ نَعَمْ: اَلْحُرِّيَّةُ الشَّرْعِيَّةُ عَطِيَّةُ الرَّحْمٰنِ

*Yani,*

· *İman bunu iktiza ediyor* (gərəkdirir) *ki, tahakküm* (zorla hökm etmə) *ve istibdat ile başkasını tezlil etmemek* (zillətə salmamaq) *ve zillete düşürmemek, ve zâlimlere tezellül etmemek* (*zalımlar qarşısında zəlil olmamaq)...*

· *Allah›a hakikî abd* (qul) *olan, başkalara abd* (qul) *olamaz*.

· *Birbirinizi, Allah›tan başka kendinize Rab yapmayınız. Yani, Allah›ı tanımayan, herşeye, herkese nispetine göre bir rububiyet tevehhüm* (zənn) *eder, başına musallat eder.*

*Evet, hürriyet-i şer'iye (şəri azadlıq), Cenâb-ı Hakkın Rahmân, Rahîm tecellîsiyle bir ihsanıdır ve imanın bir hassasıdır (xüsusiyyətidir)."*(1)

*"Sünnet-i Nebeviyeyi hedef-i maksat (sünnəti əsas məqsədi) eden ittihad-ı İslâm (İslam birliyi), Hürriyeti tehdit eder (məhdudlaşdırar) ve levâzım-ı medeniyeye münâfidir (mədəniyyətin gərəyi olan şeylərə ziddir)" diyorlar.*

*Elcevap: Asıl mü'min, hakkıyla hürdür (azaddır). Sâni-i Âleme (aləmin sənətkarı olan Allaha) abd (qul) ve hizmetkâr olan, halka tezellüle (xalq qarşısında zillətə) tenezzül etmemek gerektir. Demek, ne kadar*

1 (Hutbe-i Şamiyye, s. 61-62)

*imana kuvvet verilse, hürriyet de o kadar kuvvet bulur.*

*Amma hürriyet-i mutlak (mütləq, heç bir şeylə məhdudlaşdırılmayan azadlıq) ise, vahşet-i mutlakadır, belki hayvanlıktır. Tahdid-i hürriyet (azadlığı məhdudlaşdırmaq) dahi, insaniyet nokta-i nazarından zarurîdir.*

*Salisen (üçüncüsü): Bazı sefih ve lâubaliler (biveclər), hür (azad) yaşamak istemediklerinden, nefs-i emmarenin esaret-i rezilesi (pisliyi əmr edən nəfsin rəzil əsarəti) altına girmek istiyorlar.*

*Elhasıl (xülasə): Şeriat dairesinden hariç olan hürriyet (azadlıq):*

*~ ya istibdat; veya*

*~ esaret-i nefis (nəfsin əsarəti); veya*

*~ canavarcasına hayvanlık; veya*

*~ vahşettir.*

*Böyle lâubaliler (biveclər) ve zındıklar iyi bilsinler ki, dinsizlikle ve sefahetle, sahib-i vicdan (vicdan sahibi) hiçbir ecnebîye kendilerini sevdiremezler ve benzetemezler. Zira mesleksiz ve sefih, sevilmez. Ve bir kadına yakışır, istihsan ettiği (bir qadının bəyəndiyi) libası, erkek giyse, maskara (məsxərə) olur."*[1]

*"Hürriyeti (azadlığı), âdâb-ı şeriatla takyid ediniz (şəriətin ədəbilə məhdudlaşdırın). Zira (çünki) câhil efrad (fərdlər) ve avam-ı nas (avam insanlar) kayıtsız hür (azad) olsa, şartsız tam serbest olsa, sefih ve itaatsiz olur."*[2]

*"Şeriat-ı garrâ (böyük və parlaq şəriət), kelâm-ı ezelîden (Allahın əzəli kəlam sifətindən) geldiğinden, ebede gidecektir. Nefs-i emmare-*

1 (Hutbe-i Şamiyye, s. 97)

2 (Divan-ı Harb-i Örfî, İki Mekteb-i Musibetin Şehadetnamesi, s. 17)

*nin istibdad-ı rezilesinden selâmetimiz (pisliyi əmr edən nəfsin rəzil istibdadından bizim* əmin-amanlığımız), *İslâmiyete istinad iledir. O hablü›l-metine* (sağlam ipə) *temessük* (sarılmaq) *iledir. Ve haklı hürriyetten hakkıyla istifade etmek, imandan istimdad* (yardım) *iledir. Zira* (çünki), *Sâni-i Âleme* (aləmin sənətkarı olan Allaha) *hakkıyla abd* (qul) *ve hizmetkâr olanın, halka ubudiyete* (xalqa qulluq etməsinə) *tenezzül etmemesi gerektir.»* [1]

*"Ey ebnâ-yı vatan (vətən övladları)! Hürriyeti sû-i tefsir (azadlığı yalnış təfsir) etmeyiniz; ta elimizden kaçmasın ve müteaffin olan (çürümüş) eski esareti, başka kapta bize içirmekle bizi boğmasın.* **(Haşiyə)**

*Zira hürriyet (çünki azadlıq), mürâât-ı ahkâm (Allahın hökmlərinə riayət etmək) ve âdâb-ı şeriat (şəriətin ədəbi) ve ahlâk-ı hasene (gözəl əxlaq) ile tahakkuk (gerçəkləşir) ve neşvünemâ bulur (böyüyüb inkişaf edir).*

*Sadr-ı evvelin (İslamın başlanğıc dövründəkilərinin), yani Sahabe-i Kiramın (böyük səhabələrin), o zamanda, âlemde vahşet ve cebr-i istibdat hükümferma olduğu (istibdadın hökm sürdüyü) halde, hürriyet ve adalet ve müsavatları (bərabərlikləri), bu müddeâya (iddia edilən şeyə) bir burhan-ı bâhirdir (açıq bir dəlildir).*

*Yoksa, hürriyeti (azadlığı), sefahet ve lezaiz-i nâmeşrua (qeyri məşru ləzzətlər) ve israfat ve tecavüzat ve hevâ-i nefse ittibâda (nəfsin həvasına tabe olmaqda) serbestiyet ile tefsir ve amel etmek, bir padişahın esaretinden çıkmakla ve alçakların istibdadı ve esaret-i rezilesinin (rəzil əsarəti) altına girmekle beraber, milletin çocukluk istidadını ve sefih olduğunu gösterdiğinden, paralanmış olan eski esarete lâyık ve hürriyete adem-i liyâkatini (azadlığa layiq olmadığını) gösterir. Zira*

---

1 (Divan-ı Harb-i Örfî, "Yaşasın Şeriat-ı Ahmedî (a.s.m)", s. 55)

2 **(Haşiyə)** Evet, daha dehşetli bir istibdat ile, pek acı ve zehirli bir esareti bize içirdiler.

*(çünki) sefih, mahcurdur (mal üzərində təsərrüfü əlindən alınmış kimsə kimidir). Geniş ve muşa'şa' olan (parlayan) yeni hürriyet-i şer'iyeye (şəri azadlığa) adem-i liyâkat (layiq olmamaq)—zira çocuğa geniş olmaz—şanlı olan ittihad-ı millîyi (milli birliyi) bozulmuş ve müteaffin olan hâlât (çürümüş hallar) ile fena bir hastalığa hedef edecektir. Zira (çünki) ehl-i takvâ ve vicdanın (vicdan və təqva əhlinin) tefsiri, böyle değil. Mezhebi de muhalif olacaktır.*

*Biz millet-i Osmaniye (Osmanlı milləti), erkeğiz. Kâmet-i merdane-i istidad-ı milliyemize (milli istedadımızın mərd görünüşlü qamətinə), kadınların libası gibi süslü sefahet ve hevesat ve israfat yakışmıyor. Binaenaleyh (bundan dolayı), aldanmayalım.*

خُذْ مَا صَفَا دَعْ مَا كَدَرْ

*'Səfa verən şeyi al; kədər verən şeyi tərk et.' kâidesini (qaydasını), düsturu'l-amel yapalım (iş düsturumuz edək).*[1]

*"Sual: Hürriyeti bize çok fena tefsir etmişler. Hatta âdetâ (sanki) hürriyette, insan, her ne sefahet ve rezalet işlerse, başkasına zarar vermemek şartıyla birşey denilmez, diye bize anlatmışlar. Acaba böyle midir?*

*Cevap: Öyleleri hürriyeti değil, belki sefahet ve rezaletlerini ilân ediyorlar ve çocuk bahanesi gibi hezeyan ediyorlar. Zira (çünki), nâzenin hürriyet (nazlı olan azadlıq), âdâb-ı şeriatla müteeddibe ve mütezeyyine (şəriətin ədəbilə ədəblənmiş və bəzənmiş) olmak lâzımdır.*

*Yoksa, sefahet ve rezaletteki hürriyet, hürriyet değildir. Belki hayvanlıktır, şeytanın istibdadıdır. Nefs-i emmâreye (pisliyi əmr edən nəfsə) esir olmaktır.*

*Hürriyet-i umumî (ümumi azadlıq), efrâdın zerrât-ı hürriyâtının*

---

1 (Divan-ı Harb-i Örfî, "Hürriyete Hitap", s. 69-70)

*muhassalıdır (hər bir fərdin azadlığının nəticəsidir). Hürriyetin şe'ni odur (azadlığın şənindəndir) ki, ne nefsine, ne gayrıya zararı dokunmasın."*[1]

Demək, Ustad Said Nursi (rahmətullahi aleyh)'in yuxarıdakı bəyanlarından anlaşılır ki, Demokratlara yazılan məktublarda keçən ***"demokratlık"*** və ***"hürriyyet-i vicdan"*** təbirlərindən murad, qanun cəhətilə bəşərin bəşərə nökər olmamasıdır. Nə bir fərd olan padşaha, nə də bir camaat olan Milli Məclisə nökər olmadan, İlahi əhkama bağlanaraq, yalnız Allaha qul və nökər olub qulluq vəziyyətinə bürünmək və kiçik nəmrud və fironların istibdadından qurtulmaqdır. Yoxsa, xəlifəliyin istibdadından qurtulub Milli Məclisin istibdadına qayıtmaq deyildir. Əksinə, Quranın ədalətinə istinad etməkdir.

Məsələni icmal etsək, Ustad, Demokrat Partiyası mənsublarına deyir ki:

*"Sizlər, 'hürriyyet-i vicdan' əsasını,* سَيِّدُ الْقَوْمِ خَادِمُهُمْ *yəni, 'Memuriyet, emirlik ise, reislik değil, millete bir hizmetkârlıktır.' qanuna istinad etdirin! Yəni, hakimiyyəti, qeydsiz-şərtsiz Allaha verin; İlahi əhkamın xadimi olun; İslam dininə və o din ətrafında toplanan Müsəlmanlara xidmətçi olun; bəşəri qanunlara istinad edərək, qanunlar pərdəsi altında fironluq, nəmrudluq etməyin! Allaha qarşı azad, bir-birinizə qarşı qul vəziyyəti almayın. Əksinə, hamınız bərabər, bir tək Allaha qul, bir-birinizə qarşı azad olun."*

Bax, həqiqi azadlıq da, budur!

**(Çünkü, kuvvet, kanunda olmazsa, şahsa geçer. İstibdad, mutlak keyfi olur.)**

Bu cümlədə keçən **"kanun"** təbirindən murad, Ustadın ifadəsilə,

1 (Münazarat, s. 19-20)

İlahi əhkamdır. Bu mənada, əgər qüvvət, İlahi qanunlara istinad etməzsə, o vaxt istibdad olar. Xalq, bu halda, ya şəxsin və ya camaatın istibdadı altına girər. Bu da, Ustadın ifadəsilə, fironluqdur. Halbuki, ***“Amir (əmr edən), Hakim (hökm edən), Adil”*** kimi isimlərdə, Allahın şəriki yoxdur və ola da bilməz. Ancaq məna-yı hərfilə ***“amir, hakim, adil”*** isimləri alına bilər. Yəni, idarəçi, *“Allahın hökmü budur.”* deyə hökm verə bilər. Yoxsa, *“Mənim hökmüm budur.”* deyə bilməz.

Mətndə keçən **“kanun”** təbirindən murad, zikr etdiyimiz məna olduğunda dəlil, bütün İslam alimlərinin, haqq din haqqındakı tərifləridir:

*“Din, ağıl sahiblərini, öz iradələrilə şəxsən xeyr olan şeylərə sövq edən İlahi qanunlar mənzuməsidir.”*

Deməq, dinin şəxsən özü qanundur. *“Kuran, insana bir kitab-ı şeriattır.”* deyən də, Ustadın şəxsən özüdür.[1]

Xülasə, Ustad, Demokratlara belə deyir:

*“Cumhuriyyət Xalq Partiyası’nın bəşəri qanunlara istinad edib hər bir məmurunu kiçik nəmrudlar, fironlar qıldığına qarşılıq; siz, İslam həqiqətlərinə istinad edin. Həyatın hər sahəsində, xüsusilə, elmi, əməli və ədəbi sahələrdə, İlahi əhkamı hakim qılın. Bununla da, haqqı ilə ibadətə layiq olan Allaha, qul olduğunuzu göstərin.”*

**(Millet Partisi ise: Eğer İttihad-ı İslâmdaki esas olan İslâmiyet milliyeti -ki, Türkçülük onun içinde mezc olmuş bir millet olsa-, o Demokratın mânâsındadır, dindar Demokratlara iltihak etmeye mecbur olur.)**

*Millət Partiyası isə: əgər mənfi milliyyətçiliyi tərk etsə, yəni türkçülüyü buraxsa və müsbət milliyyət olan İslamiyyət milliyyətini əsas məqsəd qılsa; bu, zatən demokratlıq mənasındadır. Yəni, bir tək Allaha qul olub,*

1 (25-ci Söz: “Mucizat-ı Kuraniye”, Müqəddimə, 1-ci cüz, s. 357)

*digər insanlara qarşı isə azad olmaq mənasındadır. Türk milləti də, o İslamiyyət milliyyəti içinə daxildir. Onlar da, Allaha quldurlar və İslam milliyyətinə sarılmaqla, başqalarının nökərliyindən qurtularlar.*

**(Frenk illeti tâbir ettiğimiz ırkçılık, unsurculuk fikriyle, Avrupa, âlem-i İslâmı parçalamak için, içimize bu frenk illetini aşılamış. Fakat bu hastalık ve fikir, gayet zevkli ve câzibedar bir hâlet-i ruhiye verdiği için, pek çok zararları ve tehlikeleriyle beraber, zevk hatırı için, her millet, cüz'î-küllî, bu fikre iştiyak gösteriyorlar.)**

Burda Ustad Said Nursi (rahmətullahi aleyh)'in ***"kavim"*** yerinə ***"millet"*** təbirini istifadə etməsi, bir həqiqəti xatırlatmaq üçündür. Belə ki:

Fərqli irqlərə mənsub olan Müsəlmanların, öz millətlərini, yəni müsbət milliyyət olan İslam milliyyətini və İslam dinini müdafiə etmələri lazım gəldiyi halda; zövq xatiri üçün irqçilik adı altında başqa bir cərəyana qapılır, mənfi milliyyət olan irqçiliyi, İslamiyyət milliyyətinə tərcih edir və İslam milliyyətini tərk edib öz irqlərini müdafiə edirlər. Beləcə, müsbət milliyyətdən mənfi milliyyətə keçirlər. Bu isə, İslam milliyyətini buraxıb küfr milliyyətini müdafiə etmək deməkdir. Çünki insanları küfrə sövq edən amillərdən biri də, irqçilikdir.

**Xülasə:** Müsbət milliyyət, İslamiyyət milliyyətidir; mənfi milliyyət isə, küfr milliyyətidir.

**Not:**

*"Millət, din və ümmət"* təbirləri, «*haqq millət, haqq din və haqq ümmət"* şəklində istifadə edildiyi kimi; *"batil millət, batil din və batil ümmət"* tərzində də istifadə edilməkdədir. Məsələn, gələcək ayətdə *"millət"* təbiri, *"batil millət"* (yəni, batil din) mənasında istifadə edilmişdir:

إِنِّى تَرَكْتُ مِلَّةَ قَوْمٍ لَّا يُؤْمِنُونَ بِٱللَّهِ وَهُم بِٱلْءَاخِرَةِ هُمْ كَـٰفِرُونَ

*"Mən Allaha iman gətirməyən, özləri də axirəti inkar edən adamların millətindən (yəni dinindən) uzaqlaşmışam."*(1)

Kafirun surəsində keçən *"din"* kəliməsi isə, həm *"haqq din",* həm də *"batil din"* mənasında istifadə edilmişdir:

لَكُمْ دِينُكُمْ وَلِىَ دِينِ

*"Sizin dininiz sizə, mənim dinim də mənədir!"*(2)

**(Şimdiki terbiye-i İslamiyyenin zafiyyetiyle)** yəni, *28 il iqtidarda qalan Cumhuriyyət Xalq Partiyası dövründə, dövlətin İlahi əhkamdan uzaqlaşması ilə* **(ve terbiye-i medeniyyenin)** yəni, onların təbiri ilə, *bir mədəniyyətin, yəni zahiri mədəni tərbiyyənin* **(galebesiyle ekseriyyet kazanarak başına geçerse; ekseriyyet teşkil etmeyen ve ancak yüzde otuzu hakiki türk olan ve yüzde yetmişi başka unsurlardan olanlar; hem hakiki türklerin, hem hakimiyyet-i İslamiyyenin aleyhine cebhe almaya mecbur olacaklar.)** Çünki mənfi milliyyətçiliyi əsas tutan Millət Partiyasının iqtidara gəlməsi halında, dövlət idarəsində türkçülüyü hakim qılacağından; 70% olan digər irqlər, dövlətə qarşı cəbhə alacaqlar və mübarizəyə girişəcəklərdir. Bundan, həm türk milləti, həm də İslam, böyük zərər görəcəkdir. Çünki dövlət, türkçülüyü əsas aldığı üçün, nə qədər *"Mən, dindaram."* desə belə, digər irqlər, onun bu dindarlığını qəbul etməzlər. *"Siz, irqçilik edirsiniz."* deyər və Millət Partiyasının türkçülük etməsinə qarşılıq, digər irqlər, o zamankı türklərə ədavət etdikləri kimi; türklərin 1000 il İslama bayraqdarlıq edən nəcib dədə-babalarına da ədavət bəsləyərlər. Həm də, o irqlər,

1 (Yusuf/37)

2 (Kafirun/6)

türklərin irqçilik naminə etdikləri mənfi hərəkətlərini, xarici güclərin təhrikilə, İslama nisbət edər və İslama qarşı ədavət bəsləyərlər.

Ustad, Demokratlara məna olaraq belə deyir:

*“Siz, ictimai həyatın hər sahəsində İslamı hakim qılın. Bununla, idarəni, irqə söykənməkdən və irqçiliyi hiss etdirən bir ismi daşımaqdan qurtarıb İslam qardaşlığını təsis etmiş olarsınız. Bura, əvvəldən bəri İslam diyarıdır. Bu millət, 1000 ildən çox İslama xidmət etmişdir. Siz də, Allahın hökmlərini hakim qılmaqla İslama xidmətçi olun. Yoxsa, İslamınız da gedər və buna bağlı olaraq şərəfiniz də əldən çıxar.”*

Görüldüyü kimi, Ustad Nursi, Demokrat Partiyası mənsublarına, bu tövsiyyələri verir:

**a.** Millət Partiyası, türkçülüyü əsas alır. Siz, türkçülüyə qarşılıq, İslam milliyyətini əsas alın!

**b.** İrqçiliyi tərk edin. Dövlətə irqçiliyi hiss etdirməyən və bütün Müsəlmanları qucaqlayacaq bir ad verin.

Təəssüf ki, Demokratlar, Millət Partiyası mənsublarından daha çox irqçi oldular.

**(Çünkü, İslâmiyetin bir kanun-u esasîsi olan bu âyet-i kerime, وَلاَ تَـزِرُ وَازِرَةٌ وِزْرَ اُخْـرٰي ’dır. Yani, *“Birisinin günahıyla başkası muahaze ve mes’ul olmaz.”***

**Halbuki, ırkçılık damarıyla, bir adamın cinayetiyle mâsum bir kardeşini, belki de akrabasını, belki de aşiretinin efradını öldürmekte, kendini haklı zanneder. O vakit, hakikî adalet yapılmadığı gibi, şiddetli bir zulüm de yol bulur. Çünkü *“Bir mâsumun hakkı, yüz câniye feda edilmez”* diye, İslâmiyetin bir kanun-u esasîsidir.**

**Bu ise, çok ehemmiyetli bir mesele-i vataniyedir. Ve hâkimiyet-i İslâmiyeye, büyük bir tehlikedir.**

**Madem hakikat budur, ey dindar ve dine hürmetkar Demokratlar!)**

Ustadın bu ifadələri, təşviq və təltif üçündür. Bir insana, *"yaxşı insansan, yaxşı insansan"* deməklə yaxşılaşması qəbilindəndir. Əvvəldən bəri, İslam alimlərinin idarəçilər haqqında izlədikləri bir irşad metodudur. Yəni, *"Çalışın, İlahi əhkamı həyatın hər sahəsində hakim qılın, bu iltifata layiq olun."* deməkdir. Demokrat Partiyası mənsubları isə, Ustadın tövsiyyələrini yerinə yetirmədiklərindən, bu təltifə layiqliklərini də itirdilər.

**(Siz, bu iki partinin gayet kuvvetli ve zevkli ve câzibedar nokta-i istinadlarına mukabil, daha ziyade maddî ve mânevî cazibedar nokta-i istinad olan hakaik-i İslâmiyeyi, nokta-i istinad yapmaya mecbursunuz.)**

Ustad Said Nursi, Demokratlara mənən deyir ki:

*"Xalq Partiyası, qanunlar pərdəsi altında, məmurlarına bir məqam verərək, sanki onları Nəmrud kimi istibdada sövq etdi.*

*Millət Partiyası isə, iqtidara gəldiyi təqdirdə, irqə söykənər və türkçülüyü əsas qılmaq surətilə, digər irqlərin nifrətini cəlb edər.*

*Sizlər, bu 2 partiyanın batil olan istinad nöqtələrinə qarşılıq; haqq olan İslam həqiqətlərinə istinad edin, həyatın hər sahəsində İlahi əhkamı hakim qılın, İslam qardaşlığını təsis edin. Yoxsa, onlar kimi etsəniz, yəni irq naminə bəşəri qanunları hakim qılsanız, həm dövlət, həm millət, həm də siz zərər edərsiniz."*

İslam hüququna görə, bu cümlədə keçən ***"hakaik-i İslamiyye"*** təbirindən məqsəd, ictimai həyatın hər sahəsində, xüsusən elmi, əmə-

li və ədəbi sahələrdə, idarəçilərin və rəiyyətin icra və tətbiq etməklə mükəlləf olduqları İlahi əhkamdır. İlahi əhkamın bir qismi, fərz-i ayndır; bununla hər Müsəlman mükəlləfdir. Bir qismi də, fərz-i kifayədir; bununla da ümmət mükəlləfdir.

Qısacası, ***"hakaik-i İslamiyye",*** bütün əmrlər və qadağalardır. Bunların ən əhəmiyyətlisi isə, tətbiqi, Muhamməd ümmətindən bir camaata fərz-i kifayə olan və ***"İslam şüarları***" deyə təbir olunan dinin əhkamıdır.

Ustad, 1923-cü ilin yanvarında, Milli Məclisə yazdığı bir xütbədə, onların vəzifələrinin, Quranın əmrlərinə tabe olmaq və İslam şüarlarını diriltmək olduğunu, beləcə bildirmişdir:

*"1339 TARİHİNDE (1923-cü ildə), MECLİS-İ MEB'USANA (milli məclisə) HİTABEN YAZDIĞIM BİR HUTBENİN SURETİDİR*

اِنَّ الصَّلٰوةَ كَانَتْ عَلَى الْمُؤْمِنِينَ كِتَابًا مَوْقُوتًا

*"Namaz, möminlərə müəyyən olunmuş vaxtlarda vacib edilmişdir."* (1)

*Ey mücâhidîn-i İslâm (İslam mücahidləri)! Ey ehl-i hall ü akit (millət vəkilləri)! Bu fakirin bir meselede on sözünü, birkaç nasihatini dinlemenizi rica ediyorum.*

***Evvelâ:*** *Şu muzafferiyetteki hârikulâde nimet-i İlâhiye (İlahi nemət), bir şükran ister ki, devam etsin, ziyade olsun. Yoksa, nimet şükrü görmezse, gider.*

*Madem ki, Kur'ân'ı, Allah'ın tevfikiyle (yardımı ilə) düşmanın hücumundan kurtardınız. Kur'ân'ın en sarih (açıq) ve en kat'î emri olan "salât" (namaz) gibi ferâizi (fərzləri) imtisal etmeniz (yerinə yetirməyiniz) lâzımdır—ta onun feyzi (bərəkəti), böyle harika suretinde üstünüzde tevâli (davam etsin) ve devam etsin.*

1 (Nisa/103)

***Saniyen (ikincisi):** Âlem-i İslâmı (İslam aləmini) mesrur ettiniz, muhabbet ve teveccühünü kazandınız. Lâkin o teveccüh ve muhabbetin idamesi (davamı), şeâir-i İslâmiyeyi iltizamla (İslam şüarlarını yerinə yetirməklə) olur. Zira (çünki), Müslümanlar, İslâmiyet hesabına sizi severler.*

***Salisen (üçüncüsü):** Bu âlemde, evliyaullah hükmünde olan gazi ve şühedalara (şəhidlərə) kumandanlık ettiniz. Kur'ân'ın evâmir-i kat'iyesine imtisal etmekle (qəti əmrlərini yerinə yetirməklə), öteki âlemde de, o nurânî güruha (zümrəyə) refik (dost) olmaya çalışmak, sizin gibi himmetlilerin şe'nidir (çalışqan insanların şanındandır). Yoksa, burada kumandan iken, orada bir neferden istimdad-ı nur etmeye (nur istəməyə) muztar (çarəsiz) kalacaksınız. Bu dünya-yı deniyye (aşağı dünya), şan ve şerefiyle öyle bir metâ (mal) değil ki, sizin gibi insanları işbâ etsin (doyursun), tatmin etsin ve maksud-u bizzat (şəxsən qəsd edilən) olsun.*

***Rabian (dördüncüsü):** Bu millet-i İslâmın (müsəlmanların) cemaatleri, çendan (hərçənd) bir cemaat namazsız kalsa, fâsık da olsa, yine başlarındakini mütedeyyin (dindar) görmek ister. Hattâ, umum şarkta, umum memurlara dair en evvel sordukları sual bu imiş:*

*'Acaba namaz kılıyor mu?' derler.*

*Namaz kılarsa, mutlak emniyet ederler; kılmazsa, ne kadar muktedir olsa, nazarlarında müttehemdir (ittiham ediləndir).*

*Bir zaman, Beytüşşebab aşâirinde (aşirətində) isyan vardı. Ben gittim, sordum:*

*'Sebep nedir?'*

*Dediler ki:*

*'Kaymakamımız, namaz kılmıyordu, rakı içiyordu. Öyle dinsizlere, nasıl itaat edeceğiz?'*

*Bu sözü söyleyenler de namazsız, hem de eşkıyâ idiler.*

***Hamisen (beşincisi):*** *Enbiyanın ekseri, Şarkta; ve hükemanın ağlebi (filosofların əksəriyyəti) Garpta gelmesi, kader-i ezelînin bir remzidir (əzəli qədərin bir işarətidir) ki, Şarkı ayağa kaldıracak, din ve kalbdir, akıl ve felsefe değil. Şarkı intibaha getirdiniz; fıtratına muvafık bir cereyan veriniz. Yoksa, sa'yiniz, ya hebâen (boş-boşuna) gider, veya muvakkat, sathî kalır.*

***Sadisen (altıncısı):*** *Hasmınız ve İslâmiyet düşmanı olan frenkler, dindeki lâkaytlığınızdan pek fazla istifade ettiler ve ediyorlar. Hattâ diyebilirim ki, hasmınız kadar İslâma zarar veren, dinde ihmalinizden istifade eden insanlardır. Maslahat-ı İslâmiye (İslamın lehinə olan faydalar) ve selâmet-i millet (millətin, yəni müsəlmanların əmin-amanlığı) namına, bu ihmali (ehmalkarlığı) a'mâle (əmələ) tebdil etmeniz (dəyişdirməyiniz) gerektir.*

*Görülmüyor mu ki, İttihatçılar o kadar harika azm ü sebat (əzm və mətanət) ve fedakârlıklarıyla, hattâ İslâmın şu intibâhına da bir sebep oldukları halde, bir derece dinde lâübâlilik (biveclik və laqeydlik) tavrını gösterdikleri için, dahildeki milletten nefret ve tezyif (həqarət) gördüler. Hariçteki İslâmlar, dindeki ihmallerini görmedikleri için, hürmeti verdiler.*

***Sabian (yeddincisi):*** *Âlem-i küfür (inkar dünyası, yəni Avropa), bütün vesaitiyle (vasitələrilə), medeniyetiyle, felsefesiyle, fünunuyla (fənlərilə), misyonerleriyle, âlem-i İslâma (İslam aləminə) hücum ve maddeten uzun zamandan beri galebe ettiği halde, âlem-i İslâma (İslam aləminə) dinen galebe edemedi. Ve dahilî bütün fırak-ı dâlle-i İslâmiye (İslam camaatları içindəki sapıq firqələr) de, birer kemmiye-i kalile-i muzırra (zərərli azlıq) suretinde mahkûm kaldığı; ve İslâmiyet metanetini ve salâbetini (dindəki ciddiyyətini), sünnet ve cemaatle muhafaza*

*eylediği bir zamanda, lâübâliyâne (bivec bir şəkildə), Avrupa medeniyet-i habise (xəbis, pis mədəniyyət) kısmından süzülen bir cereyan-ı bid'atkârâne (bidətçi bir cərəyan), sinesinde yer tutamaz.*

*Demek, âlem-i İslâm (Müsəlmanlar) içinde mühim ve inkılâpvâri bir iş görmek, İslâmiyetin desâtirini (düsturlarına) inkıyadla (boyun əyməklə) olabilir, başka olamaz. Hem olmamış, olmuşsa da, çabuk ölüp sönmüş.*

***Saminen (səkkizincisi):** Zaaf-ı dine (dinin zəifləməsinə) sebep olan Avrupa medeniyet-i sefihanesi (səfeh mədəniyyəti) yırtılmaya yüz tuttuğu bir zamanda ve medeniyet-i Kur'ân'ın (Quran mədəniyyətinin) zuhura (ortaya çıxmağa) yakın geldiği bir anda, lâkaydâne (laqeyd bir şəkildə) ve ihmalkârâne (ehmalkar bir şəkildə), müsbet bir iş görülmez. Menfîce, tahripkârâne (təxrib edərcəsinə görülən) iş ise, bu kadar rahnelere (yaralara) mâruz kalan İslâm, zaten muhtaç değildir.*

***Tasian (doqquzuncusu):** Sizin bu İstiklâl Harbindeki muzafferiyetinizi ve âli hizmetinizi takdir eden ve sizi can'ü-dilden (cal və qəlbdən) seven, cumhur-u mü'minîndir (əksəriyyətlə möminlərdir). Ve bilhassa (xüsusilə) tabaka-i avâmdır (avam təbəqədir) ki, sağlam Müslümanlardır. Sizi ciddî sever ve sizi tutar ve size minnettardır ve fedakârlığınızı takdir ederler. Ve intibaha gelmiş en cesim (böyük) ve müthiş bir kuvveti size takdim ederler. Siz dahi, evâmir-i Kur'âniyeyi imtisalle (Quranın əmrlərini yerinə yetirməklə) onlara ittisal (birləşmək) ve istinad etmeniz, maslahat-ı İslâm (İslamın faydası) namına zarurîdir. Yoksa, İslâmiyetten tecerrüt eden, bedbaht, milliyetsiz, Avrupa meftunu frenk mukallitleri, avâm-ı Müslimîne (avam müsəlmanlara) tercih etmek, maslahat-ı İslâma münâfi (İslamın faydasına zidd) olduğundan, âlem-i İslâm (İslam aləmi), nazarını başka tarafa çevirecek ve başkasından istimdat edecek (yardım istəyəcək).*

*Âşiren* (onuncusu): *Bir yolda dokuz ihtimal-i helâket (həlak olma ehtimalı), tek bir ihtimal-i necat (qurtulma imkanı) varsa, hayatından vazgeçmiş, mecnun bir cesur lâzım ki, o yola sülûk etsin (getsin).*

*Şimdi, yirmi dört saatten bir saati işgal eden farz namaz gibi zaruriyat-ı diniyede* (dinin zəruri olan şeylərində), *yüzde doksan dokuz ihtimal-i necat* (qurtuluş ehtimalı) *var. Yalnız, gaflet ve tembellik hasiyetiyle, bir ihtimal, zarar-ı dünyevî* (dünyəvi zərər) *olabilir. Halbuki ferâizin (fərzlərin) terkinde, doksan dokuz ihtimal-i zarar* (zərər ehtimalı) *var. Yalnız gaflet ve dalâlete istinad, tek bir ihtimal-i necat* (qurtuluş ehtimalı) *olabilir*.

*Acaba, dine ve dünyaya zarar olan ihmal ve ferâizin (fərzlərin) terkine, ne bahane bulunabilir? Hamiyet (dində iləri olma, dini qeyrət) nasıl müsaade eder?*

*Bâhusus (xüsusilə), bu güruh-u mücâhidin (mücahid zümrənin) ve bu yüksek meclisin ef'âli (felləri, hərəkətləri) taklid edilir. Kusurlarını, millet ya taklit veya tenkit edecek; ikisi de zarardır.*

*Demek, onlarda hukukullah (Allahın haqları), hukuk-u ibâdı (qulların haqlarını) da tazammun (ehtiva) ediyor. Sırr-ı tevatür (təvatür) ve icmâı tazammun (ehtiva) eden hadsiz ihbaratı (xəbərləri) ve delâili (dəlilləri) dinlemeyen ve safsata-i nefis (nəfsin həzəyanlarından) ve vesvese-i şeytandan (şeytanın vəsvəsəsindən) gelen bir vehmi (şübhəni, zənni) kabul eden adamlarla, hakikî ve ciddî iş görülmez.*

*Şu inkılâb-ı azîmin (böyük inqilabın) temel taşları, sağlam gerek. Şu meclis-i âlinin (Milli Məclisin) şahsiyet-i mâneviyesi (mənəvi şəxsiyyəti), sahip olduğu kuvvet cihetiyle, mânâ-yı saltanatı (səltənət mənasını) deruhte etmiştir (öz üzərinə götürmüşdür). Eğer şeâir-i İslâmiyeyi bizzat imtisal etmek (Əgər İslam şüarlarını şəxsən yerinə yetirmək) ve ettirmekle mânâ-yı hilâfeti (xilafət mənasını) dahi vekâleten (vəkalət*

*olaraq) deruhte etmezse (öz üzərinə götürməzsə), hayat için dört şeye muhtaç, fakat an›ane-i müstemirre (yerləşmiş adət) ile günde lâakal (ən az) beş defa dine muhtaç olan şu fıtratı bozulmayan ve lehviyat-ı medeniyeyle (mədəniyətin haram əyləncələri ilə) ihtiyâcât-ı ruhiyesini (ruhi ehtiyacını) unutmayan bu milletin hâcât-ı diniyesini (dini ehtiyaclarını), Meclis tatmin etmezse, bilmecburiyye (məcburi olaraq), mânâ-yı hilâfeti (xilafət mənasını), tamamen kabul ettiğiniz isme ve lâfza verecek. O mânâyı idame etmek (davam etdirmək) için, kuvveti dahi verecek.*

*Halbuki, Meclis elinde bulunmayan ve Meclis tarikiyle (yolu ilə) olmayan böyle bir kuvvet, inşikak-ı âsâya (birliyin pozulmasına) sebebiyet verecektir. İnşikak-ı âsâ (birliyin pozulması) ise,* وَاعْتَصِمُوا بِحَبْلِ اللهِ جَمِيعًا *"Hamınız Allahın ipindən möhkəm yapışın."*[1] *ayetine zıttır.*

*Zaman, cemaat zamanıdır. Cemaatın ruhu olan şahs-ı mânevî (mənəvi şəxsiyyət), daha metindir. Ve, tenfiz-i ahkâm-ı şer'iyeye (şəriətin hökmlərinin təsirli olmasına), daha ziyade muktedirdir (güc sahibidir). Halife-i şahsî (xəlifə), ancak ona istinad ile vezâifi (vəzifələrini) deruhte edebilir (öz üzərinə ala bilər). Cemaatin ruhu olan şahs-ı mânevî (mənəvi şəxsiyyət), eğer müstakim (istiqamətli) olsa, ziyade parlak ve kâmil olur. Eğer fena olsa, pek çok fena olur. Ferdin iyiliği de, fenalığı da mahduttur. Cemaatin ise, gayr-ı mahduttur. Harice karşı kazandığınız iyiliği, dahildeki fenâlıkla bozmayınız. Bilirsiniz ki, ebedî düşmanlarınız ve zıtlarınız ve hasımlarınız, İslâmın şeâirini (şüarlarını) tahrip ediyorlar.*

*Öyleyse, zarurî vazifeniz, şeâiri ihyâ (İslam şüarlarını diriltmək)*

---

1 (Al-i İmran/103)

*ve muhafaza etmektir. Yoksa, şuursuz olarak, şuurlu düşmana yardımdır. Şeâirde tehâvün (şüarlara əhəmiyyət verməmək), zaaf-ı milliyeti (müsəlmanların zəifliyini) gösterir. Zaaf ise, düşmanı tevkif etmez (dayandırmaz), teşci eder (cəsarətləndirər).*

حَسْبُنَا اللهُ وَنِعْمَ الْوَكِيلُ • نِعْمَ الْمَوْلٰى وَنِعْمَ النَّصِيرُ

*"Bizə, Allah yetər. O, nə gözəl vəkildir."*[1]**;**

*"O, nə gözəl dost və nə gözəl yardımçıdır."*[2]

Ustad Nursi'nin ifadə etdiyi və İslam fəqihlərinin təsbit etdiyi, ümmətdən bir camaatın tətbiq və icrası ilə mükəlləf olduğu ***"Şeair-i İslamiyye"*** (İslam şüarları)"nın bəzilərini, belə sıralaya bilərik:

**1.** Zəkatın ümumi bir düstur halında tətbiq edilməsi, zəkat verməyənlərə fiqhin təyin etdiyi cəzaların verilməsi;

**2.** Namazın bir ümumi düstur halına gətirilməsi, namaz qılmayanlara, məzhəblərin ixtilafına görə cəzaların verilməsi;

**3.** Qeyr-i məşru əyləncələrin qadağan edilməsi;

**4.** İslamın qadınlara verdiyi haqların tətbiq edilməsi;

**5.** Faizin qadağan edilməsi;

**6.** Ədalət sahibi olanların, yəni böyük günahları işləməyən və kiçik günahlarda da israr etməyən kimsələrin idarəyə gətirilməsi;

**7.** Oğruların əllərinin kəsilməsi;

**8.** Zinaya, dinin təyin etdiyi cəzanın tətbiqi;

**9.** Cümə gününün tətil olması;

---

1 (Al-i İmran/173);

2 (Ənfal/40) (Mesnevi-i Nuriye, "Hubab", s. 86-88

**10.** Sünnətə müxalif bütün icraatların qaldırılması;

**11.** Hər kəsə lazım olan dinin zəruriyyatının təhsil kitablarında yer alması;

**12.** İslama dil uzadanların, Quranın tədibilə tərbiyə edilməsi;

**13.** Miras hüququnun şəri çərçivədə icra olunması;

**14.** Qisas hökmlərinin tətbiqi;

**15.** İçki və qumarın qadağan edilməsi və bu günahların işləndiyi yerlərin bağlanması və s.

Bütün bu saydıqlarımız, İslam alimlərinin ittifaqı ilə, ***"hakaik-i İslamiyye ve şeair-i İslamiyye"***dəndir və bunlar, şəxsi fərzlərdən, yəni fərz-i aynlardan daha əhəmiyyətlidir. Əgər ümmət, camaat olaraq tətbiq və icrası ilə mükəlləf olduğu fərz-i kifayə olan bu əmrləri yerinə yetirsə, bütün xalq, iki həyatın (dünya və axirət) səadətini əldə edib Allahın əzabından qurtularlar. Əks təqdirdə, bütün ümmət, Allah qatında məsul olar və iki həyat səadətinin zərərinə hərəkət etmiş olarlar.

Ustad Nursi (rahmətullahi aleyh), iman və İslamı belə tərif etməkdədir:

*"Ulema-i İslâm (İslam alimləri) ortasında 'İslâm' ve 'iman'ın farkları çok medar-ı bahsolmuş (bəhs səbəbi olmuşdur). Bir kısmı "İkisi birdir," diğer kısmı "İkisi bir değil, fakat biri birisiz olmaz" demişler ve bunun gibi çok muhtelif fikirler beyan etmişler. Ben şöyle bir fark anladım ki:*

*İslâmiyet iltizamdır (tərəfdarlıqdır); iman iz›andır (qəti bir şəkildə inanmaqdır). Tabir-i diğerle (başqa şəkildə ifadə etsək), İslâmiyet, hakka tarafgirlik ve teslim ve inkıyaddır (boyun əyməkdir); iman ise, hakkı kabul ve tasdiktir.*

*Eskide bazı dinsizleri gördüm ki, ahkâm-ı Kur'âniyeye (Quranın hökmlərinə) şiddetli tarafgirlik gösteriyorlardı. Demek, o dinsiz, bir cihette Hakkın iltizamıyla (Haqqa tərəfdar olmaqla) İslâmiyete mazhardı; "dinsiz bir Müslüman" denilirdi. Sonra bazı mü'minleri gördüm ki, ahkâm-ı Kur'âniyeye (Quranın hökmlərinə) tarafgirlik göstermiyorlar, iltizam etmiyorlar; "gayr-ı müslim bir mü'min" tabirine mazhar oluyorlar.*

*Acaba İslâmiyetsiz iman, medar-ı necat (qurtuluş səbəbi) olabilir mi?*

*Elcevap: İmansız İslâmiyet, sebeb-i necat (qurtuluş səbəbi) olmadığı gibi, İslâmiyetsiz iman da, medar-ı necat (qurtuluş səbəbi) olamaz."* (1)

*"Bidayet-i Hürriyette (Hürriyyətin ilk illərində, 1908-ci ildə), İttihatçılar içine girmiş dinsizleri görüyordum ki, İslâmiyet ve şeriat-ı Ahmediye (Muhamməd şəriətinə), hayat-ı içtimaiye-i beşeriye (ictimai həyat) ve bilhassa (xüsusilə) siyaset-i Osmaniye (Osmanlı siyasəti) için, gayet nâfi (çox faydalı) ve kıymettar (qiymətli) desâtîr-i âliyeyi cami (uca düsturları, prinsipləri cəm edən) olduğunu kabul edip, bütün kuvvetleriyle şeriat-i Ahmediyeye (Muhamməd şəriətinə) taraftar idiler. O noktada Müslüman, yani iltizam-ı hak (haqq tərəfdarı) ve hak taraftarı oldukları halde, mü'min değildiler.*

*Demek, "müslim-i gayr-ı mü'min" (mömin olmadığı halda İslama tərəfdar olan) ıtlakına istihkak kesbediyordular (adlandırmağa haqq qazanırlar).*

*Şimdi ise, frenk usulünün ve medeniyet namı altında bid›atkârâne (bidətçi) ve şeriat-şikenâne (şəriətə zidd) cereyanlara taraftar olduğu halde, Allah›a, âhirete, Peygambere imanı da taşıyor ve kendini de mü›min biliyor.*

1 (Məktubat, 9-cu Məktub, s. 31

*Madem, hak ve hakikat olan şeriat-ı Ahmediyenin kavânînini iltizam etmiyor (Peyğəmbərin şəriətinin qanunlarına tərəfdarlıq etmir) ve hakikî tarafgirlik etmiyor, gayr-ı müslim bir mü'min oluyor.*

*İmansız İslâmiyet sebeb-i necat (qurtuluş səbəbi) olmadığı gibi, bilerek İslâmiyetsiz iman dahi dayanamıyor, belki necat veremiyor, denilebilir.»*[1]

Ustad Nursi'nin bu ifadələri, gələcək ayətlərdən mülhəmdir. Bu ayətlər, ***"hakaik-i İslamiyye"***nin əsaslarını və o əhkamın necə tətbiq və icra ediləcəyini də, belə ifadə etməkdədir:

...فَإِن تَنَـٰزَعْتُمْ فِى شَىْءٍ فَرُدُّوهُ إِلَى ٱللَّهِ وَٱلرَّسُولِ إِن كُنتُمْ تُؤْمِنُونَ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْـَٔاخِرِ ۚ ذَٰلِكَ خَيْرٌ وَأَحْسَنُ تَأْوِيل

*«...Əgər bir şey haqqında ixtilafa düşsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və Onun Elçisinə müraciət edin. Bu, sizin üçün daha xeyirli və nəticə etibarilə daha yaxşıdır.»* [2]

فَلَا وَرَبِّكَ لَا يُؤْمِنُونَ حَتَّىٰ يُحَكِّمُوكَ فِيمَا شَجَرَ بَيْنَهُمْ ثُمَّ لَا يَجِدُوا۟ فِىٓ أَنفُسِهِمْ حَرَجًا مِّمَّا قَضَيْتَ وَيُسَلِّمُوا۟ تَسْلِيمًا

*"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca, iman gətirmişolmazlar."*[3]

1 (Barla Lahikası, 271-ci Məktub, s. 307-308)

2 (Nisa/59)

3 (Nisa/65)

Deməktən, yuxarıdakı ayətlər və Ustadın ifadəsilə, ***"İslamiyyet",*** İlahi əhkamın Muhamməd ümmətindən bir camaat tərəfindən icrasına, İlahi əhkamın həyatın hər sahəsində, xüsusən, elmi, əməli və ədəbi sahələrdə hakim olmasına tərəfdar olmaqdır və İlahi əhkamın zahir qismidir. ***"İman"*** isə, bu əhkamı qəlbən təsdiq etməkdir.

O halda, əziz Ustadın, ***"hakaik-i İslamiyyeyi nokta-i istinad yapmaya mecbursunuz."*** cümləsindən muradı:

~ həm Allahın hökmlərini tətbiq və icra etməklə məcbur və mükəlləfsiniz. Çünki bu vəzifə, sizə fərz-i kifayədir;

~ həm də dünya və axirətdə İlahi əzabdan qoruna bilməniz üçün, buna məcbursunuz.

Ustad Nursi, bu cümləsilə, Demokrat Partiyası mənsublarına, ictimai həyatın hər sahəsini, xüsusən, elmi, əməli və ədəbi sahələri ***"hakaik-i İslamiyye"***yə, yəni Allahın hökmlərinə dayandırılması gərəkdiyini, açıq bir şəkildə ifadə etmişdir. Təəssüf ki, onlar, bu mövzuda Ustadı dinləmədilər.

**(Yoksa, sizin yapmadığınız eskiden beri cinayetleri, nasıl eski partiye yüklüyorlarsa, size de yükleyip, Halkçılar, ırkçılığı elde edip tam sizi mağlûp etmeye bir ihtimal-i kavî ile hissettim. Ve İslâmiyet namına telâş ediyorum.)**

Ustad, Demokratlara belə deyirdi:

*"Həyatın hər sahəsini, xüsusilə, elmi, əməli və ədəbi sahələri, İslam həqiqətlərinə istinad etdirməsəniz, İslama və əmanət olaraq sizə verilən səltənətə xəyanət etmiş olarsınız. İslamı hakim qılmaq şərəfini itirərsiniz və əvvəkilərin işlədiyi bütün cinayətlər və pis əməllər, yəni, həm Xalq Partiyasının, həm də digərlərinin işlədikləri pis işlər və zülmlər, sizə yüklənib zərər görərək məğlub olacağınızdan, nə siz-*

*lər üçün, nə də partiyanız üçün deyil, əksinə, İslam üçün narahatam. Sizlər də, eyni qanunları tətbiq etsəniz, o qanunları tətbiq edən digər partiyaları, Allah sizə musallat edər, onların əlilə sizləri cəzalandırar. Çünki zahirən inanırmış kimi görünürsünüz; və lakin digər partiyalar kimi hərəkət edirsiniz."*

Onlar isə, Ustad (rahmətullahi aleyh)'i dinləmədilər, tövsiyyələrini qəbul etmədilər, İslam həqiqətlərinə istinad etmədilər, dinə təzim etmədilər və nəticədə silinib getdilər. Qurana istinad etməyən bir zümrəyə, Haqq Taala, digər bir zümrəni musallat etdi. Quran naminə, İlahi ədalətin tətbiqini onlara təbliğ edən Ustadı dinləmədikləri üçün, həm dinə, həm də özlərinə zərər verdilər.

Ustad, Demokrat Partiyası mənsublarına deyir:

*"Sizlər, iqtidarsınız və çoxluqdasınız. Fürsət əlinizdə ikən, dərhal İslam həqiqətlərini həyatın hər sahəsində hakim qılın. Əgər bunu etsəniz, bu, İslamın lehinə olar. İslam, bir an əvvəl hakim olar. Əgər Quran həqiqətlərini hakim qılmazsanız, bu ertələnmiş olacaqdır. Bu da, İslam üçün zərərdir. Belə bir zərər isə, ancaq irəlidə gələcək yeni bir nəsil tərəfindən ortadan qaldırıla bilər. Sizin indi bunları düzəltməməyiniz isə, İslama qarşı edilən bir xəyanətdir. Hər nə qədər sizlər bu vəzifəni ifa etməsəniz də, Allah, nurunu mütləq tamamlayacaqdır. İrəlidə bu işin əhillərini gətirib dinini hakim qılacaqdır."*

**(Eskilerin lüzumsuz keyfî kanunları ve su-i istimalleri neticesiyle, belki de tahrikleriyle zuhur eden Ticanî meselesini ve ağır cezalarını dindar Demokratlara yüklememek ve âlem-i İslâm nazarında Demokratları düşürmemenin çare-i yegânesi, kendimce böyle düşünüyorum:**

**Nasıl ezan-ı Muhammediyenin (a.s.m.) neşriyle, Demokratlar on derece kuvvet bulduğu gibi, öyle de, Ayasofya'yı da beş yüz**

**sene devam eden vaziyet-i kudsiyesine çevirmektir. Ve âlem-i İslâmda çok hüsn-ü tesir yapan ve bu vatan ahalisine âlem-i İslâmın hüsn-ü teveccühünü kazandıran, bu yirmi sene mahkemeler, bir muzır cihetini bulamadıkları; ve beş mahkeme de beraatine karar verdikleri Risale-i Nur'un resmen serbestiyetini, dindar Demokratlar ilân etmelidirler. Tâ, bu yaraya bir merhem vurmalı. O vakit âlem-i İslâmın teveccühünü kazandıkları gibi, başkalarının zâlimane kabahati de, onlara yüklenmez fikrindeyim.**

**Dindar Demokratlar, hususan Adnan Menderes gibi zatların hatırları için, otuz beş seneden beri terk ettiğim siyasete, bir-iki gün baktım (Haşiyə) ve bunu yazdım.)**

Azanın ərəbcə oxunması ilə əlaqəli olaraq, 13 ilə 17 iyun 1950 tarixli qəzetlərdə, bu məlumatlara təsadüf edirik:

*"Kanun adı: 526 saylı ceza kanununun, Arabca ezan ve hutbe okunmasını yasaklayan kanunun ibtali."*

Qanun təklifini, Demokrat Partiyası vermişdi. Ancaq bu partiya xaricindəki digər millət vəkilləri müxalifət etməmiş, əksinə, müsbət səs vermişdilər. Yəni, bu qanun, bütün millət vəkillərinin səslərilə meyda-

1 **(Haşiyə)** Əziz Ustadın məktubunda istifadə etdiyi ***"İslam kahramanı Adnan Menderes"*** və ***"Dindar Demokratlar"*** kimi bəzi təbirləri, yenə Özü, **"lüzumsuz"**, ***"zararlı"*** və ***"mülayim"*** olaraq vəsfləndirir. ***"Emirdağ lahikası - ll"***də, ***"Kalbe ihtar edilen ictimai hayatımıza aid bir hakikat"*** başlığı ilə yazılan və ***"Bu vatanda şimdilik dört parti var...."*** deyə davam edən məktubun uzunca Haşiyəsindən sonra, ikinci bir haşiyəsi də var. Tənvir Nəşriyyat'ın 1991-ci ildə nəşr etdiyi ***"Emirdağ Lahikası - ll"***nin 148-ci səhifəsindəki bu Haşiyədə belə deyilir

*"Ustad diyor ki: 'Bu ictimai, siyasi mesele, mücmel olarak ihtar edildi. Ve tabiratta lüzumsuz, zararlı kelimeleri, siz tebdil edebilirsiniz. Merkezlerden münasib gördüğünüz yerlere -su'i tesir yapmamak şartıyla- göndere bilirsiniz. Mülayim bazı tabirlerime, Nurların serbestiyyeti için bir manevi rüşvet ve okşamak nazarıyla bakabilirsiniz ve o kusurumu afv edersiniz."*

na çıxmışdır. Bununla bərabər, o tarixdəki qəzetlərin yazdığına görə, Adnan Menderes, İsmət İnönü'yə, inqilaba toxunmayacağına dair söz vermişdi.

Deməh, Demokrat Partiyası mənsubları, azanın ərəbcə oxudulması xüsusunda, sadəcə qanun təklifi vermiş və bu mövzuda, o günki bütün millət vəkillərinin müsbət səslərilə bərabər, bu qanun icra olunmuşdur.

Həm bu mövzuda, Adnan Menderes tərəfindən, İnönüyə, inqilablara toxunmayacaqlarına dair də söz verilmişdir.

O halda, deyilə bilər ki, Demokratlar, siyasətlərinin mənfəəti üçün, kifayə sünnət olan azanın elanı xüsusunda təklif verdilər; İslam şüarları təbir edilən bütün kifayə fərzləri isə, tətilə uğratdılar.

İndi biz, əhl-i insafdan soruşuruq: Şərh və izah etdiyimiz bu məktubda, Ustadın, Demokrat Partiyası›na tərəfdar olduğunu; və ya demokratiyanı dəstəklədiyini hiss etdirən bir cümlə belə göstərilə bilərmi? Əsla və əsla!

O halda, Ustad Nursi (rahmətullahi aleyh), bu məktubda, Demokrat Partiyasını təsvib etmir, əksinə, Quranın hakim qılınmasını, onlara tövsiyyət və təbliğ edir.

Əziz Ustadımız, zamanındakı bütün idarəçilərə Quranın hakimiyyəti altında Müsəlmanların birlik və bərabərliklərini təmin etmək İlahi əmrini təbliğ etdiyi kimi; Demokrat Partiyası mənsublarına da bu xüsusu təbliğ etmişdir. Demək, bu təbliğ, sadəcə Demokrat Partiyası mənsublarına xas deyildir.

Ustadın onlara yazdığı məktublar, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in, Pərviz Kisra (fars kralı), Herakl (roma kralı) kimi bəzi dövlət adamlarına yazmış olduğu məktublar növündəndir və İslam həqiqətlərini hakim qılmaları üçün, onlara bir İslami dəvətnamə hök-

mündədir və İlahi əhkamın tətbiqi üçün bir təbliğ qəbilindəndir. Necə ki, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in, o məktublarında, onları dəstəkləmədiyi, əksinə, İslam dinini onlara təbliğ etdiyi açıqdırsa; Ustadın Demokratlara yazdığı məktublar da, eyni mənadadır.

Vəlhəmdulilləhi Rabbi'l-Ələmin.

* * *

**Vəzifəyə hərislik göstərməyin məkruhluğu haqqında gələn hədislərdən bəziləri bunlardır:**

**7148-** əbu Hureyrə (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm), belə buyurmuşdur:

***"Həqiqətən, siz, əmirliyə (vəzifəyə) can atacaqsınız. Halbuki, əmirlik (vəzifə), qiyamət günü peşmançılıq olacaqdır (gətirəcəkdir). O (əmirlik, vəzifə), nə gözəl süd verəndir və nə pis süddən kəsəndir."***

**7149-** əbu Musa (radiyallahu anh)'dan belə rəvayət edilir:

Qövmümdən 2 nəfərlə birlikdə, Nəbi (sallallahu aleyhi və səlləm)'in hüzuruna daxil olmuşdum. Onlardan biri, *"Ey Allahın rəsulu! Mənə, əmirlik (yəni əmirlikdə bir vəzifə, iş) ver!"* dedi. Digəri də, bunun eynisini söylədi. (Bunun üzərinə) Allah rəsulu (sallallahu aleyhi və səlləm), belə buyurdu:

***"Biz, vəzifəni özü tələb edənə və hərisliklə istəyənə verməmrik."***

..............................................................................

## İzahı:

**"Əmirliyi hərisliklə istəməyin məkruhluğu babı".**

***"Əmirlik"*** məfhumuna:

~ xəlifəlik demək olan ***"böyük əmirlik";*** ilə

~ bəzi diyarlara "valilik" mənasına gələn ***"kiçik əmirlik"***

daxildir. Bu, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in, bir şeyi, daha baş vermədən əvvəl xəbər verməsidir. Necə ki, eynilə Onun dediyi kimi də baş vermişdir.

***"Halbuki, əmirlik (vəzifə), qiyamət günü peşmançılıq olacaqdır***

***(gətirəcəkdir).”***

Yəni, bu vəzifəni gərəkdiyi şəkildə yerinə yetirməyən kimsə üçün peşmançılıq olacaqdır.

Bunu, Muslim, əbu Zərr (radiyallahu anh)’dan nəql etdiyi bu hədisdə qeyd etməkdədir:

“Mən (əbu Zərr):

*‘Ey Allahın rəsulu! Mənə vəzifə vermirsənmi?’* dedim.

O (sallallahu aleyhi və səlləm), əlilə çiynimə vurduqdan sonra:

***‘Ey əbu Zərr! Şübhəsiz, sən, zəifsən. Əmirlik (vəzifə) isə, bir əmanətdir. Şübhəsiz ki, o, qiyamət günündə, bir rüsvaylıq və bir peşmanlıqdır. Onu haqqı ilə alan və bu xüsusda üzərindəkini əskiksiz yerinə yetirən müstəsnadır.”*** **(Muslim, “Əmirlik kitabı”, “Bir zərurət olmadan əmir olmağın məkruhluğu babı”)**

Nəvəvi, belə deyir:

*“Bu hədis, -xüsusilə özündə zəiflik olan kimsələr üçün- vəzifəni üstlənməkdən çəkinmək xüsusunda, böyük bir prinsipdir.*

*• Əhil olmadığı halda bu vəzifəyə gələn və sonra ədaləti təmin edə bilməyən kimsələr üçün, etdikləri ehmalkarlıqdan (vəzifədəki səhlənkarlıqlarından) dolayı, qiyamət günü rüsvaylıqla cəzalandırıldıqları təqdirdə, bu, bir peşmançılıq olacaqdır.*

*• Vəzifəyə əhil olub, adil davranan kimsə üçün -xəbərlərdən anlaşıldığı üzərə- böyük bir əcr bəhs mövzusudur.*

*Lakin vəzifəyə gəlməkdə böyük bir təhlükə vardır. Bundan dolayı, böyüklər, vəzifə almaqdan çəkinmişlərdir.*

*Ən doğrusunu, Allah bilir.»*

**“O (əmirlik, vəzifə), nə gözəl süd verəndir və nə pis süddən kəsəndir.”**

Davudi, bu cümləni belə açıqlayır:

*“O (əmirlik, vəzifə), dünyada nə gözəl süd verəndir; və öldükdən sonra isə, nə pis süddən kəsəndir.*

*Çünki insan, etdiklərindən dolayı, hesaba çəkiləcəkdir. Dolayısı ilə, bu vəzifə, hələ süd əmmək ehtiyacı bitməyən məmədən kəsən ana kimidir ki, bu, uşağın ölməsinə səbəb olur.»*

• Bir başqası isə, bu cümləni belə açıqlamışdır:

*“O, nə gözəl bir süd anadır. Çünki insan, bu vəzifəyə gəldiyində, mərtəbə, mal əldə edər, sözü keçər, maddi bəzi ləzzətlər əldə edər.*

*Ancaq ölümlə və ya başqa bir səbəblə o vəzifədən ayrılma halında, axirətdə səbəb olduğu bəzi məsuliyyətlərdən dolayı, nə pis bir süddən kəsəndir!”*

Hədisdən, vəzifəyə gələn bir kəsin, əldə etdiyi nemət və səadətin, qarşılaşacağı bədbəxtlik və zərərdən daha az olacağı anlaşılmaqdadır. Bu,

~ ya dünyada ikən vəzifədən uzaqlaşdırılaraq baş verir ki, bu halda, insan, bilinməz, itirilib-axtarılmaz bir şəxs halına gəlir;

~ ya da axirətdə məsuliyyətdir ki, bu, daha da ağırdır.

Uca Allahdan məğfirət diləyirik.

Qadı Beydavi, belə deyir:

*Ağlı başında olan bir kəsə, ardından həsrət verən şeylərin gəldiyi ləzzət və fərəhlənmək, yaraşmaz.*

Mühəlləb’in görüşü isə, bu yöndədir:

*«Bir vəzifəni hərisliklə istəmək, insanların o vəzifə uğrunda, bir-bi-*

*rilə mübarizə aparmasına səbəbdir. Bunun sonunda qan axar, mallar və irzlər mübah görülər, yer üzündə fəsad böyüyər.*

*Peşmanlığın hansı səbəbdən qaynaqlandığına gəlincə, insan, öldürülə bilər və ya vəzifədən uzaqlaşdırıla bilər; ya da ölər və o vəzifəyə gəldiyinə peşman olar. Çünki işlədiyi məsuliyyətli şeylərdən hesaba çəkilər. Halbuki özü, hərisliklə istəmiş olduğu şeyi ondan ayrı düşdüyü üçün əldən qaçırmışdır.»*

Mühəlləb, belə davam edir:

*«Bundan, -bir valinin, ölməsi və ardından o işi özündən başqa görəcək kimsənin qalmaması nümunəsində olduğu kimi- vəzifə üçün tək qalmaq halı müstəsnadır. Bu halda, insan, vəzifəyə gəlmədiyi təqdirdə, xalqın aqibətinin pisə doğru gedəcəyi üçün, fəsad meydana gələr.»*

Biz də, bunu əlavə edək:

Bu, bir əvvəlki hədisdə, tələb edərək və ya etməyərək vəzifəyə gəlmə şəklindəki fərziyyəyə zidd deyildir. Əksinə, «hərislik» kəliməsi, insanların halları pozular qorxusu ilə bir vəzifəyə gələn kimsə -özündə ümumiyyətlə hərislik olmayacağı üçün- istəmədən vəzifə verilmiş kimsə kimi olacağına işarət etməkdədir.

Bir vəzifə üçün tək qalmış şəxsin həris olması -o vəzifəni almaq, özü cəhətindən vacib olacağı üçün- əfv edilə bilər.

Xəlifənin, hakimlik vəzifəsinə birini təyin etməsi, fərz-i ayndır.

Hakimin, özündən başqa biri daha olduğu halda bu vəzifəyə gəlməsi isə, fərz-i kifayədir.[1]

---

1 (İbn Həcər Asqalani, «Fəthu'l-Bari», 93-cü kitab: «Kitabu'l-Əhkam» (Hökmlər kitabı); 7-ci bab: «Əmirliyi (vəzifəni) hərisliklə istəməyin məkruhluğu babı»)

## Dövlət başçısı necə təyin edililir?

İmam əbu›l-Həsən əl-Mavərdi, ***«əl-Əhkamu’s-Sultaniyyə»*** adlı əsərində, belə deyir:

**Xəlifənin təyini və hüquqi halı:**

**a. Xəlifənin təyini:**

İmamət adı verilən Xilafət, din və dünyaya aid işlərin icra edilməsi üçün, Nübüvvətə xələf olaraq qoyulmuş, qəbul edilmiş bir müəssisədir. Dövlət başçılığı vəzifəsini icra edənə, bütün Müsəlman topluluğun tabe olmasının gərəkdiyi xüsusunda, icma vaqe olmuşdur. Alim əl-Əsam, bu icmaya qatılmamaqdadır.

Dövlət başçısına tabe olmağın bir ağıl işimi, yoxsa dinin əmrimi olduğu mövzusunda, görüş ayrılığı vardır. Belə ki:

**a.** Xəlifəyə tabe olmağın əqlən vacib olduğunu söyləyənlərin görüşü:

Dövlət başçısına tabe olmaq, xalqı pislikdən, zülmdən uzaqlaşdırır. Xəlifə, tərəflər arası düşmənlikləri ortadan qaldırır. Bütün bunlar, ağılla düşünülə bilən xüsuslardır. İdarəçilər olmasa, xalq, son dərəcə qarışıq, bayağı, zülmlər içində davam edən bir həyat içində yaşayar. Cahiliyyə dövrü şairlərindən əl-Əfvəhu’l-Əvdi, bir şeirində belə deyir:

*«İnsanların cahilləri idarəçilər olduğunda, insanlar pisliklərdən qurtula bilməyəcəyi kimi, rahatlıq da tapa bilməyəcəklərdir.»*

**b. Dinən xəlifəyə tabe olmağın gərəkdiyini deyənlərə görə:**

(Dini cəhətdən dövlət başçısına bağlanmağın vacib olduğu görüşünə görə), dini işlər bir tərəfə qoyularsa, ağıl yolu ilə xəlifənin dünyaya aid hüquqi işləri icra edə biləcəyi qəbul edilə bilər. Lakin ağıl,

fərdlərin dinə və qanuna bağlılığını əmr edə bilməz. Yalnız ağıl sahibi, hər bir şəxsin pislik etməsini əngəlləyər. Mərhəmətdə, yaxınlaşmada, ədalətin gərəkləri nədirsə, onu qəbullanar. İşə, əqli bir ədalət məfhumu ilə başlayar. İnsan, yalnız öz ağıl və düşüncələri ilə işləri icra edər. Başqalarının düşüncələrindən isə, çox da faydalanmaz. Halbuki din, dini sahələrdə işləri icra edənlərə, dünyaya aid işlərin də verilməsini əmr edir. Allah Taala da:

*«Ey iman gətirənlər! Allaha və Elçisinə itaət edin, həm də özünüzdən olan rəhbərlərə şəriətə uyğun şəkildə itaət edin.»*[1] ayətini endirmişdir.

Bizə, bizdən olan və əmr etmə səlahiyyətini ehtiva edən xəlifələrə və digərlərinə itaət etmək, fərz olmuşdur. Hişam b. Urvə, əbu Salihdən; o da, əbu Hureyrə (radiyallahu anh)'nin Peyğəmbər (sallallahu aleyhi və səlləm)'dən belə buyurduğunu rəvayət edir:

*«Məndən sonra, bəzi idarəçilər sizi idarə edəcəkdir. Yaxşılar yaxşılıqları ilə; pislər də pisliklərilə sizi idarə edəcəklərdir. Haqqa uyğun olan hər xüsusda, onlara itaət edin, eşidin. Yaxşılıq edərlərsə, bu, həm sizin üçün, həm də onlar üçün yaxşıdır. Pislik edərlərsə, bu, sizin lehinizə, onların əleyhinədir.»*[2]

**B. Xəlifəni seçəcək olanlar və şərtləri:**

Dövlət başçısı olmağın lüzumu, onun (xəlifəlik) haqqında bilik əldə etmək, hərb və elm öyrənmək kimi bir fərz-i kifayədir. İslam topluluğunun bir qismi bu vəzifəni yerinə yetirincə, digərləri borcdan qurtularlar.

İnsanlar arasından biri çıxıb Dövlət başçılığı vəzifəsini yerinə yetirməyincə, topluluqdan 2 qrup çıxır:

1 (Nisa/59)

2 (İbn Macə, «İqamə»/47)

• **Birincisi: Seçicilər topluluğu.** Bunlar, topluluq üçün bir xəlifə seçərlər;

• **İkincisi: Xəlifəliyə namizədlərdir.** Aralarından biri, xəlifəliyə seçilər.

Müsəlman xalqın meydana gətirdiyi cəmiyyətdə, bu 2 qrupun xaricində qalanlar üçün, xəlifə seçiminin gecikməsində bir çətinlik və günah yoxdur.

Xəlifənin məcburi olaraq varlığını qəbulda, bəhsi keçən 2 qrupun hüquqi varlığı başa düşülüncə, hər qrup (yəni seçənlər və seçilənlər) üçün, bəzi şərtlər axtarılar:

**a. Seçicilər üçün axtarılan şərtlər:**

**1.** Hər yönü ilə doğru bilinən, adil bir şəxs olmaq;

**2.** Xəlifəliyə namizəd olan şəxsdə axtarılan şərtləri bilməyə kifayət qədər məlumat sahibi olmaq;

**3.** Birdən çox xəlifəliyə namizədlər olarsa, onlardan hansının ammə (ümuma aid) işlərini idarəyə ən müqtədir; bu növ işləri ən yaxşı biləni seçməyə götürən bilik və görüş sahibi olmaq;

Xəlifəliyə namizədlərin öz diyarlarından (ölkələrindən) olan seçicilərin, başqa yerlərdən olan seçicilərə bir üstünlükləri yoxdur. Ancaq dini mahiyyətdə olmayıb, örfən, xəlifə seçimində işlərin icra edilə bilməsi üçün xəlifəliyə namizəd olanların öz ölkələrinin hazır olan seçicilərindən biri, seçki işləri üçün idarəçi ola bilər. Çünki xəlifənin gördüyü işlərə, onun ölkəsində, kimlərin xəlifəliyə əhil olduğuna dair kifayət qədər məlumat mövcuddur.

**C. Xəlifədə axtarılan şərtlər:**

**b. Xəlifəliyə əhil olanlarda axtarılan şərtlər:**

**aa.** Hər yönü ilə adil kimsə olmaq;

**bb.** Xilafətin vəzifələrinə aid olan bütün işlərdə, ictihad edə biləcək dərəcədə elm sahibi olmaq;

**cc.** Qulaq, göz, dil kimi orqanlarının (bu orqanlarla iş görüb başa düşə biləcəyi işlərdə, asanlığı, yaxınlığı təmin üçün) sağlam olması;

**dd.** Hərəkət etməyə, sürətlə qalxıb-oturmağa əngəl olan əlilliklərdən uzaq və sağlam olmaq;

**ee.** Ammə işlərini idarəyə, xalqın sövq və idarəsini başa düşməyə faydalı olan fikir və görüşlərə sahib olmaq;

**ff.** Düşmənlə hərbə, topluluğu qorumağa imkan verən güc, qüvvət və cəsarətə sahib olmaq.

**gg.** Soy cəhətindən Qureyş'dən olmaq. Çünki bu xüsusda, hədis mövcuddur.

Keçmişdəki Müsəlmanlar, bu mövzuda (xəlifənin Qureyşdən olmasında) görüş birliyi içində olmuşlardır. Hər nə qədər bəzi hüquqçulara görə, bu şərt tənqid edilmişsə də, insanların hamısı, sonunda bu görüşü qəbul etmişlərdir.

Əbu Bəkr, Ənsarın, Dövlət başçısı -xəlifə- olaraq Sə›d b. Ubadə›yə biət etməsi üzərinə, Səqifə günü Ənsara, Peyğəmbər (sallallahu aleyhi və səlləm)›in:

*«Dövlət başçısı (imam), Qureyş'dəndir.»* hədisini dəlil gətirmişdi. Ənsar da, ixtilafı tərk edərək, *«Əbu Bəkrin rəvayətini təsdiq və təslim üçün, bizdən bir əmir, sizdən də bir əmir»* fikrindən döndülər. Əbu Bəkrin:

*«Bizlər, amirlərik; sizlərsə, vəzirlərsiniz.»* sözündən məmnun qalmışdılar.

Peyğəmbər (sallallahu aleyhi və səlləm):

*«Qureyşi irəli keçirin, başqalarını tərcih edib irəli keçirməyin.»* buyurmuşdur.

Bütün Müsəlmanlarca qəbul edilən bu dəlilə qarşı gələnin bir şübhəsi və müxaliflərin də bir sözü və bəyanı mövcud deyildir.

**D. Xəlifənin tənsibi (uyğun görülməsi)**

**Xilafət və İmamət vəzifəsi:**

~ *ya seçicilərin seçməsi surətilə;* və ya

~ *əvvəlki xəlifənin təyini ilə* olmaq surətilə, 2 şəkildən birilə olur.

**a.** Seçicilərin seçməsi surətilə təşəkkül edən xəlifəliyin tam təşəkkülü sırasında gərəkli olan seçici sayında, bəzi şərtlər mövcuddur. Belə ki:

**aa.** Bütün bir dövlət sərhədləri içində olan seçicilər heyətinin (ashabu›l-aqd və hall)›ın əksəriyyətinin bağlılığı olmadıqca, xilafət təşəkkül etmiş olmaz. Çünki ancaq bu yolla ümumi qəbul və icma təmin edilmiş olur.

Əbu Bəkr (radiyallahu anh)›ın xəlifə seçimində tətbiq edilən muamələ və biət, bu şəkildə olmamışdır. Çünki hazır olanlar biət etmiş, qaib olanların biət etməsi gözlənilə bilməmişdir.

**bb.** Xilafətin təəssüsü üçün axtarılan ən az seçici miqdarı, 5 nəfərdir. Bunların bir araya gəlməsi və içlərindən birinin rizaları ilə xəlifə seçmələri ilə seçim tamamlanmış olur.

Bu görüşün dəlilləri, 2’dir:

~ **Birincisi**: əbu Bəkr (radiyallahu anh)’ə edilən biət, 5 nəfər ilə olmuşdur. Sonradan xalq, buna tabe olmuşdur. Bu 5 nəfər də, Ömər b.

əl-Xattab, əbu Ubeydə b. Cərrah, Useyd b. Hudayr, Bəşir b. Sə'd, əbu Huzeyfə'nin azad etdiyi nökər olan Salim'dir.

~ **İkinci dəlil isə:** Ömər, 6 nəfərdən meydana gələn bir məclis qurdu. İçlərindən 5 nəfərin digər birini xəlifə seçmələrini, ona rizaları ilə biət etmələrini istədi.

Bax bu ikinci görüş, İslam hüquqçularının əksəriyyətinin və Basralı kəlamçıların görüşüdür.

**cc.** Kufəli alimlərdən digər bəziləri də, 3 şəxslə xəlifə seçimi tamamlanmış olur, deyirlər. Nigah əqdində bir vəli və 2 şahidlə əqdin tamamlanmış olması kimi. Xilafətdə də, 3 nəfərdən ikisikin rizası və birinin xəlifə olması, 2 nəfərin ona biət etməsi ilə əqd tamamlanmış olur, fikrini müdafiə edirlər.

**dd.** Bir fikrə görə də, 1 şəxslə xilafət təəssüs edə bilər. Çünki Abbas (radiyallahu anh), Əliyə: *«Əlini uzat, Sənə biət edim.»* demişdir. Bu vəziyyətdə, insanlar,

*«Peyğəmbərin əmisi, Peyğəmbərin əmisi oğluna biət etdi. Onların iki olmasında, bir şübhən olmasın. Və Abbas, hakim idi. Bir tək hakimin verdiyi hökm, məqbuldur.»* demişlərdir.

**E. Xəlifəni seçmə üsulları:**

Seçicilər heyəti, xəlifə seçimi üçün toplandıqlarında, onlar, xilafətə namizəd olanlarda mövcud olan şərtləri qarşılaşdırarlar. Üstün və fəzilətli olana, bütün insanların dərhal itəat edə biləcəyi namizədə biət edərlər.

Seçicilər heyətindən birinin xəlifə olacağı bəhs mövzusudursa, bu vəzifə özünə təklif edilər. Əgər müsbət cavab verərsə, vəzifə ona verilər. Bağlılıq bildirilər və nəticə olaraq da xəlifəliyi qətiləşər. İslam topluluğunun hamısının ona bağlı olmaları, əmrlərinə tabe olmaları lazım gələr.

Əgər edilən təklifə mənfi cavab verərsə, qəbulu üçün məcbur edilə bilməz. Çünki xilafət əqdi, tamamilə sərbəst bir riza ilə olmalıdır. (Bu əqd), cəbr nəticəsində təşəkkül etməməlidir. Rizası olmayan namizəddən vaz keçilərək, xilafətə layiq bir başqasına təklif edilər.

Əgər xəlifəliyə namizəd 2 nəfərdə mövcud olan şərt və vəsflər bərabərdirsə, yaşca böyük olan tərcih edilir. Yaşca da bərabərdirlərsə, daha kamil, vüqar sahibi olan tərcih edilir. Hal bu olmaqla bərabər, yaşca kiçik olana biət edilə, o seçilə bilər.

Xəlifəliyə namizədlərdən biri, daha çox bilikli, digəri daha çox cəsarətlidirsə, zaman hansını gərəkdirirsə, o sifət və şərtləri daşıyan tərcih edilir. Məsələn, zaman və ehtiyaclar, üsyanların önlənməsini gərəkdirir, hüzur və sakitliyə ehtiyac duyulursa - cəsarət, güc və qüvvətcə üstün olan tərcih edilir. Əgər ehtiyaclar, elmcə üstün olmağı gərəkdirirsə, azğın fikirlərin, yalnış düşüncələrin əngəllənməsi üçün - elmcə üstün olan, xilafətə tərcih edilir.

Xəlifəliyə namizəd olan 2 nəfərdən birini seçməkdə, çətin bir hal ortaya çıxmışdırsa, belə hallarda:

**a.** Bəzi İslam fəqihlərinə görə:

Hər 2 namizəddən də vaz keçilər, ikisinin xaricində birinə müraciət edilər. Beləcə, birinin, digərini tənqid etməsi də əngəllənmiş olar.

**b.** Alimlərin və fəqihlərin əksəriyyətinə görə də:

Namizədlərin bir-birilərilə olan ixtilafı, içlərindən birinin xəlifə olmasına əngəl təşkil etməz. Xəlifə olmağı arzu etmək, məkruh deyildir. Seçicilər heyəti ixtilaf etmişdirlərsə, özünə xəlifəlik təklif olunmuş birindən bu təklifin geri alınması uyğun deyildir.

Halları bərabər olan 2 namizəd arasındakı ixtilafın həllində, bu (ikinci) qrupdakı fəqihlər ixtilaf etmişlərdir. Belə ki:

**aa.** Bəzilərinə görə: İkisi arasında püşk atılar. Püşk hansına düşərsə, xəlifə o olar və ona dərhal itaət edilər.

**bb.** Digər bir qisminə görə də: Belə bir püşkə gedilmədən, seçicilər heyəti hansına biət etmək arzulayarlarsa, onu seçməkdə sərbəstdirlər.

Seçilmək üzərə ortada xəlifəliyə namizəd yalnız bir nəfər varsa və o da, toplumun üstün şəxslərindəndirsə, heyət onu xilafətə gətirər. Sonradan xəlifəliyə daha üstün bir namizəd çıxarsa, bu hal, ilk seçilən xəlifənin xilafətinə təsir etməz.

Daha üstün bir şəxs mövcud ikən, ondan aşağı bir namizədin xilafətinə biət edilməyə başlanılmışdırsa, baxılar; əgər belə bir biət, daha üstün olan şəxsdəki xəstəlik, qaiblik kimi bir səbəbdən və ya seçilən şəxsin insanlar arasında daha çox sevilən olmasından irəli gəlirsə, bu şəxsi seçmə işi tamamlanmışdır və xəlifəliyi, hüquqi olaraq mötəbərdir. Daha üstün olanın xəlifə seçilmə işi, gündəmə gətirilməz.

Yuxarıda sayılan səbəblər xaricində, üzrsüz olaraq üstün olana biət edilmiş, daha üstün olan ehmal edilmişdirsə, üstün olanın xəlifəliyinin hüquqi olaraq məqbulluğunda ixtilaf göstərilmişdir. Belə ki:

**aaa.** Aralarında Cahiz'in də yer aldığı bəzi alimlərə görə:

Xəlifəyə biət, xilafət əqdinin təşəkkülünü təmin etməz. Çünki hüquqi (fiqhi) məsələlərdə ictihad edərkən, ən uyğun və ən münasibi tərcih edildiyi kimi, seçicilər heyətinin də 2 namizəddən daha üstün olanını seçib biət etmələri, onların vəzifələridir. Bu şəkildə hərəkət etməkdən uzaqlaşıla bilməz.

**bbb.** Fəqihlərə və kəlam alimlərinin əksəriyyətinə görə:

Daha üstün olan var ikən, üstün olana biət, hüquqən mötəbərdir. Daha üstün olan biri var ikən, üstün olanı ədliyyə işlərini idarə etməyə təyin etmək, necə mümkün və mötəbərdirsə; imam ola bilmə şərtlərini

öz üzərində daşıyan üstün bir şəxsi də, özündən daha üstün biri var ikən, imam təyin edib bağlılıq bildirmək, hüquqən doğru və mötəbərdir. Çünki daha üstün bir hal, seçimdə sadəcə bir tərcih səbəbidir. Yoxsa xəlifə olmağa mütləq olaraq haqq qazandırıcı mütləq və mötəbər bir səbəb deyildir.

Xəlifə ola bilmə şərtlərini öz şəxsində ehtiva edən bir tək şəxs varsa, eyni şərtləri ehtiva edən başqa kimsə də yoxdursa, o, xəlifə təyin edilər. Başqasına biət etmək, doğru deyildir.

**Seçimsiz və razılıqsız bir şəxsin imamlığının təşəkkül edib-edə bilməyəcəyi** mövzusunda isə, İslam alimləri arasında ixtilaf vardır. Belə ki:

**a.** Bəzi İraq fəqihlərinə görə: Seçicilər heyəti tərəfindən biət edilmədən də, bir şəxsin imamlığı təəssüs edə bilər və xalqın ona itaəti gərəklidir. Çünki seçimdən məqsəd, imamı seçməkdir. Bundan dolayı, bu məqama gələn bir şəxsdə, artıq xəlifəlik sifəti təşəkkül etmişdir.

**b.** Fəqihlərin və kəlam alimlərinin əksəriyyətinə görə:

Öz-özünə xilafət məqamına gələn bir şəxsin xəlifəliyi təəssüs etmiş olmaz. Çünki xilafət, riza və seçimlə təşəkkül edər. Seçicilər heyətinin ona xəlifəliyi verməsi surətilə, təşəkkülü təmin edilməlidir. Əgər hamısı birləşib onu seçərlərsə, imamlıq əqdi tamamlanmış sayılır. Çünki belə bir əqd, ancaq təyin ilə tamamlanır. Eynilə, ixtilaflı bir mövzuda hakim seçimində, tərəflərdən birinin razı olub, digərinin razı olmadığı bir şəxsin hakim ola bilməyəcəyi kimi. Hər 2 tərəf razılaşar və seçərlərsə, o vaxt hakim ola bilər.

Bu xüsusda, yenə bu görüşə mənsub olanların bir qismi, belə deyirlər:

*"Hakimlik mövzusunda əhil bir tək şəxs varsa, o, hakim olaraq qəbul edilər. Eynilə, xəlifəliyə namizəd olacaq və şərtləri öz üzərində daşıyan bir tək şəxsin mövcud olmasında, onun xəlifə seçilməsi kimi."*

Hakimlik ilə imamlıq arasındakı fərq isə, hakimlik xüsusi bir niyabət (vəkillik), yəni başqası adına hərəkət etməkdir. Hakimlik, hakimlik sifətinin mövcud olmasına baxmayaraq, təyinindən vaz keçilə bilər. Naib olaraq təyin edilmədikcə, hakimlik hüquqi olaraq təşəkkül etməz. İmamlıq isə, ammə haqlarından, Allahın haqqı ilə insanların haqları arasında ortaq bir haqdır. Sifət və şərtlərin hamısını öz şəxsində toplayan və imamlığı qətiləşmiş birindən vaz keçərək, daha layiq olanının təyini, doğru deyildir.

**F. İki xəlifənin təyini**

Bir dövlətdə, 2 ayrı yerdə 2 ayrı imama imamlıq vəzifəsi verilərsə, bu halda, hər ikisinin də imamlığı təəssüs etmiş olmaz. Bəzi fəqihlər, belə bir halın ola biləcəyini qəbul etsələr də, İslam hüququnda ümumi olaraq Müsəlman toplum üçün bir vaxtda 2 xəlifənin ola biləcəyi, qəbul edilməməkdədir.

2 xəlifənin hansının xilafətinin hüquqi olaraq mötəbər olduğu xüsusunda, onlar, fərqli görüşdədirlər. Belə ki:

**a.** Bir qrupa görə: Əvvəlki xəlifənin vəfat etdiyi yerdə seçilən şəxsin xəlifəliyi mötəbərdir. Çünki o ölkənin belə bir xəlifə seçməsi, seçməyə təşəbbüsləri, onların haqlarıdır. Digər bütün bölgələrin Müsəlmanları, xəlifənin vəfat etdiyi ölkə xalqına bu vəzifəni vermələri, fikir ayrılıqlarının çıxmaması üçün, onların xəlifə olaraq seçdikləri şəxsə təslim olmaları zəruridir.

**b.** Digər bir görüşə görə də: Qarışıqlıqların çıxmaması, seçicilər heyətinin tərəfsiz bir şəkildə ikisindən birini və ya bir başqasını xəlifə seçə bilməsi üçün, hər ikisinin də xilafəti tanınmaz.

**c.** Üçüncü bir fikrə görə də: İxtilafın əngəllənməsi üçün, ikisi arasında püşk atılar. Püşk hansına düşərsə, o, xilafətə haqq qazanmışdır.

**d.** Bu mövzuda doğru olan və mühəqqiqlərin, fəqihlərin fikirlərinə görə:

İki xəlifədən hansı ilk əvvəl xəlifə olmuşdursa, haqq, onundur. 2 vəlinin ayrı-ayrı nigahla bir qadını evləndirmələri kimi. Burda ilk kəsilən nigah, mötəbərdir. 2 xəlifədən hansının ilk əvvəl seçildiyi bilinirsə, xəlifə o olur. Digərinin isə, ona itaəti lazımdır. Əgər hansının əvvəl seçildiyi bilinmirsə, hər ikisinin də xəlifəliyi fasiddir.

Xilafət, ikisindən birinə və ya başqa birinə, seçicilər heyəti tərəfindən verilir. İkisinə də tabe olunar, ancaq hansının ilk əvvəl olduğunu təsbit etmək çətinləşərsə, bu halı araşdırmaq lazımdır. Hər 2 imam ixtilaf edərlərsə, hər biri özünün ilk əvvəl seçildiyini söyləyərsə, onların bu iddialarına baxılmaz; onlara, and da təklif edilməz. Çünki imamı təsbit etmək, Müsəlman topluluğun hamısının haqqıdır. İçdikləri andın, hətta xəlifəlik haqqından vaz keçməsinin bir əhəmiyyəti yoxdur. Eyni şəkildə, xilafətdəki anlaşmazlıq, birinin digərinə təslim olması ilə sonlansa belə, digərinin xəlifəliyi qətiləşmiş olmaz. Ancaq onun ilk əvvəl seçildiyinə dair bir dəlilin mövcudluğu ilə mötəbər olar.

Digərindən əvvəl birinin xəlifə olduğunu, üçüncü bir şəxs iqrar edər, digəri haqqında da üçüncü şəxslər tərəfindən belə bir iqrar olmazsa, iqrar sahibi şəxsin sözlərinə etibar edilər. Çünki bildiyi xüsusda iqrar etmək, hər Müsəlmanın vəzifəsidir. İqrar edən şəxs şahid göstərərsə, o şahidin şahidliyinə qulaq asılar. Əgər şahid şübhəli ifadə verərsə, ifadəsinə əhəmiyyət verilməz. Şübhəli ifadə verməzsə, iqrar sahibi ilə şahidin ifadələrinə etibar edilər.

**G. Xilafət ixtilafında püşkə müraciət**

Hər cür tədqiqata baxmayaraq, 2 imam arasında şübhə davam edir, ikisindən hansının ilk əvvəl seçildiyinə dair bir dəlil yoxdursa, 2 səbəbdən ötürü aralarında püşkə müraciət edilməz:

**1.** İmamlıq, bir əqddir. Püşk isə, əqdə təsir etməyən, sözləşməyə təsiri olmayan bir şeydir.

**2.** İmamlıq məqamı, heç şübhəsiz ortaq qəbul etməyən bir məqam və vəzifə yeridir. Şəriklik qəbul edilməyən bir yerdə, püşkə müraciət doğru bir şey deyildir. Eynilə, bir qadını 2 dəfə ayrı-ayrı nigahlamada olduğu kimi. Püşk, ancaq haqqında mal və bənzəri şəriklikləər mümkün olan şeylər haqqında tətbiq edilə bilər. 2 şəxs haqqında gerçəkləşən imamlıqda püşkə müraciət, işi qəti nəticəyə çatdırmaz, əksinə, bir şübhə daşımaqda davam edər. Belə bir şübhənin olmamasındansa, hər ikisinin imamlığı batil qəbul edilər; seçicilər heyəti ikisindən birini və ya bir başqasını sərbəstcə seçərlər. Bu xüsusda:

**a.** Bir görüşə görə: Xəlifəliyə namizədlərin ikisinin xaricində başqa birini seçməyin doğru olacağı qəbul edilir.

**b.** Bir digər görüşə görə də: Şübhə və tərəddüdlərə baxmayaraq, ikisindən birinə biət etmək, isabətli olar. Tərəddüdlər, hər ikisindən birinin xəlifə olmasına əngəl deyildir.

**H. Vəliəhd üsulu ilə xəlifə təyini**

Xəlifənin, özündən əvvəlki xəlifə tərəfindən təyin oluna biləcəyi, xilafət əqdinin tamamlanacağı məsələsinə toxunmaq lazım gələrsə, bu yolla da, xəlifənin təyin oluna biləcəyi xüsusunda icma vaqe olmuş, ittifaqla qəbul edilmişdir. İki səbəbdən ötürü, Müsəlmanlar bu şəkildə hərəkət etmiş, hər iki səbəbi də pis görməmişdirlər. Bunlar da:

**1.** Əbu Bəkr, (radiyallahu anh), vəfatından əvvəl Ömər (radiyallahu anh)'ı xəlifə olaraq göstərmiş, onun təyinini və Ömərin xəlifəliyini bütün Müsəlmanlar qəbul etmişlərdir.

**2.** Ömər özündən sonrakı xəlifənin seçimi xüsusunu, şuraya həvalə etmişdir. Bütün Müsəlmanlar da, qurulan bu məclisi qəbul etmişlərdir.

Çünki heyət üzvlərinin hamısı da, inanc və əxlaq yönündən zamanın tanınmış kimsələri idilər. Digər Müsəlmanlar, heyətdən xaric buraxılmışlardır.

Abbas (radiyallahu anh)'ın, Əli (radiyallahu anh)'ın bu heyətə alınmamasını ayıb olaraq görməsini Əliyə söyləməsi üzərinə, Əli, Abbasa:

*«Xəlifəlik, İslam işlərinin ən mühimlərindəndir. Şəxsimin heyətdən uzaq tutulması, Mənim üçün əhəmiyyətli deyildir.»* demişdir.

Beləcə, imamın seçimində, bir heyətin əvvəldən təyininin hüquqən məhzurlu olmadığına dair, icma vaqe olmuşdur.

Əgər imam, vəliəhd üsulu ilə bir namizəd təyin edəcəksə, ən layiq, imamlıq şərtləri ən qüvvətli olanını axtarıb tapması, şəxsi üçün vacib, çox əhəmiyyətli bir vəzifədir. Araşdırma nəticəsində, bir namizəd təsbit etmişdirsə, baxılar:

Təsbit etdiyi şəxs, oğlu və ya atası deyildirsə, seçicilər heyətindən birilə də məsləhətləşməmişdirsə, vəliəhd qəbul edib-etməmək, caizdir. Ancaq vəliəhd təyin edilən kimsəyə biət edib-etməmək xüsusunda, seçicilər heyətinin rizasının açıqlanmasının lazım gəlib-gəlmədiyi xüsusunda, görüş ayrılığı vardır:

**a.** Basralı bəzi fəqihlərə görə: Müsəlman topluluq üçün əhəmiyyətli olan, bu mövzuda vəliəhd təyin edilən şəxsə, seçicilər heyətinin müvafiq olması, şərtdir. Çünki toplumun haqqı olan imam seçmə məsələsində, öz aralarından seçdikləri seçicilər heyətinin razılığı və müvafiqliyi olmadan, bir vəliəhd təyini, toplumu bağlayıcı deyildir.

**b.** Doğru və məşhur olan görüş isə: Vəliəhd təyin edilənə, təyin edənin biəti, imam olması üçün kifayətdir. Burda seçicilər heyətinin razılığını axtarmaq, münasib olmaz. Çünki Ömərə edilən biətdə, səhabələrin razılığı və müvafiqliyinə istinad edilməmişdir. Hələ imam olanın və-

liəhdə biəti, daha təsirli; vəliəhd seçməsi, təsbiti, daha çox məqbuldur. Bu mövzuda imamın sözləri, hamısının sözündən təsirlidir.

Əgər vəliəhd, xəlifənin oğlu və ya atası olarsa, biət edib-etməməyin hüquqən doğruluğu xüsusunda, 3 ayrı həll yolu vardır:

• **Birinci yol:** Seçicilər heyətinə məsələni ərz edib, onlar da xilafət üçün vəliəhdi əhil görmədikcə, oğlu və ya atasına xəlifənin biət etməsi, doğru deyildir. Seçicilər heyəti layiq görərsə, onların bu görüşü, vəliəhdi təzkiyə (təmizə çıxarma) sayılır; xəlifənin biəti də, münasib olur.

Xəlifənin, Müsəlman topluluğuna vəliəhd təyinindəki təsərrüfü, hakim məqamında oturmasından dolayıdır. Vəliəhd təyin edilənə qarşı meyli də, artıq bir tənqid və pisləməyə haqq qazandırmaz.

• **İkinci yol:** Xəlifənin, oğlunu və ya atasını vəliəhd təyin etməsi halında, ona biət etməmək doğrudur. Çünki xəlifənin əmri, topluluğun yaxşılığına və pisliyinə dair olan xüsuslarda məqbuldur. Məqam, nəsəbdən (soydan) daha üstündür. Yüklənmiş olduğu xilafət vəzifəsini istismara haqqı yoxdur.

Bu görüşdə, xilafəti pisləməyə fürsət verilməməsi istənilməkdədir.

Topluluq içində narazılıqların çıxması arzulanmırsa, oğlunun və ya atasının xaricində birini vəliəhd göstərməlidir.

***Atasını və ya oğlunu vəliəhd təyin etməsindən sonra, seçicilər heyətinin rizasının İslam topluluğunu bağlayıcı olub-olmadığı caizdirmi, deyildirmi*** məsələsi, daha əvvəl incələnmişdir.

• **Üçüncü yol:** Atasına edilən biət əqdindən ayrılmaq, caizdir; oğluna edilən biətdən ayrılmaq isə, caiz deyildir. Çünki oğula olan təmayülün, ataya olan təmayüldən daha çox olması, insanın yaradılışı gərəyidir. Bu səbəblədir ki, qazandığı şeylərin çoxunu, atasından çox oğluna buraxmaq istəyər.

Xəlifənin, öz soyundan olan yaxınlarından birinə və ya qardaşına biəti, vəliəhd təyin etməsi, yad bir şəxsi vəliəhd təyin etmək kimidir. Ordakı sözlər, burda da caridir.

**I - Vəliəhd təyinin şərtləri, bəzi xüsusi hallar**

Xəlifə, özündə xəlifə ola bilmə şərtləri mövcud olan birini, vəliəhd təyin etdiyində, bu əhdi, vəliəhd olanın qəbul etməsi lazımdır. Yəni, vəliəhd təyininin qətiləşməsi, vəliəhd olacaq şəxsin qəbul etməsinə bağlıdır.

**Vəliəhdin xilafət vəzifəsini qəbul etmə zamanı haqqında isə, ixtilaf mövcuddur:**

**a.** Bir görüşə görə: Vəliəhd təyin edənin, ölümündən sonra münasib olan ən qısa zamanda, vəliəhdin, xilafət vəzifəsini qəbul etdiyini açıqlaması lazımdır.

**b.** Doğru olan bir digər görüşə görə: Vəliəhd təyin edilənin, xəlifənin ölümündən əvvəl, bu vəzifəni qəbul etdiyini bildirməsi lazımdır. Əvvəldən qəbul etdiyini bəyan etməlidir ki, xəlifənin ölümü ilə xilafət vəzifəsi, dərhal özünə keçsin. Ölüm hadisəsi, yalnız vəzifənin birindən digərinə keçməsi kimidir.

Vəliəhd təyin edən sultan, təyin etdiyi vəliəhdin halı dəyişmədikcə, onu əzl edə bilməz (vəzifədən uzaqlaşdıra bilməz). Təyin etdiyi şəxsləri əzl etmək, hər nə qədər mümkündürsə də, vəliəhdlik bunlara bənzəmir. Çünki işlərinin icra edilməsində təyin etdiyi məmurları, öz şəxsi üçün təyin etmişdir. İstədiyini əzl edə bilər. Lakin vəliəhdi, Müsəlmanların haqqı olaraq təyin etmişdir. Əzl etməsi, mümkün deyildir. Bu hal, eynilə halı dəyişmədikcə, seçicilər heyətinin biət etdikləri xəlifəni əzl edə bilməmələrinə bənzəməkdədir.

Xəlifə, vəliəhd təyin etdiyi bir şəxsi, vəliəhdlikdən əzl edər və onun yerinə bir başqasını təyin edərsə, ikincinin vəliəhdliyi batil və hökm-

süzdür; birincisininki isə, mötəbər olaraq qalır. Birinci vəliəhd, vəliəhlikdən özü imtina etsə də, ikincinin əvvəldən vəliəhd təyin edilmiş olması, yenə də mötəbər olmaz. Birincinin imtinasından sonra, ikincinin yenidən təyini lazımdır.

Vəliəhd təyin edilən istefa verərsə, istefası ilə vəliəhdlik sonlanmaz. Vəliəhd təyin edən imamın da, bu istefanı qəbulu lazımdır. Ondan başqa vəliəhd ola biləcək biri varsa, istefası qəbul edilər. Vəliəhd təyin edənlə, vəliəhdin istefası xüsusunda razılıq əldə olunması ilə, vəliəhd, vəliəhdlikdən çıxmış sayılar. Əgər vəliəhd ola biləcək bir başqası yoxdursa, istefa verməsi və istefasının, təyin edən tərəfindən qəbulu doğru olmaz. Cəmiyyətin mənfəətindən dolayı, vəliəhd təyin edən və ediləni, belə bir muamələ bağlayıcıdır.

Vəliəhd təyin edilən şəxsdə, vəliəhd təyin edildiyi vaxtda, imam ola bilmə şərtlərinin mövcud olması lazımdır. Vəliəhd, təyini zamanında, kiçikdirsə və ya fasiqdirdə və vəliəhd təyin edənin ölümü vaxtında baliğ və adildirsə, vəliəhdin xilafəti, ancaq seçicilər heyətinin tərəfsiz bir şəkildə biəti ilə tamamlanır.

Xəlifə, sağ olmayan birini vəliəhd təyin edərsə, onun bu təyini, doğru deyildir. Sağ olduğu bilinərsə, təyin etmə işi, onun gəlməsinə buraxılar. Vəliəhd qaib ikən, başçı vəfat edərsə, seçicilər heyəti onun gəlməsini gözləyərlər. Vəliəhd uzaq bir yerdədirsə, Müsəlmanlar onun gəlməsini gözləmək surətilə işlərində sıxıntı çəkirlərsə, seçicilər heyəti ona naib olaraq birini təyin edər; xəlifəliyinə deyil, naibliyinə biət edərlər. Uzaqdakı vəliəhd gəlincə, naib olan xəlifə əzl olunar. Xəlifənin gəlməsindən əvvəl (naibin) gördüyü bütün işlər, hüquqən məqbul, (xəlifənin) gəlişindən sonra (naibin) gördüyü işlər isə, qeyr-i məqbuldur.

Vəliəhd, xəlifənin ölümündən əvvəl, bir başqasını vəliəhd təyin etsə, bu iş, mötəbər olmaz. Çünki xilafət vəzifəsi və statusu, onun haqqında

hələ qətiləşməmişdir. Özünü, vəliəhd təyin edən öldükdən sonra belə bir təsərrüf edə bilər. Eyni şəkildə, bir şəxs üçün, *«Mən, xəlifəliyə başladığımda, sən, mənim vəliəhdimsən.»* desə, yenə hökm ifadə etməz. Çünki xəlifə olmamışdır ki, vəliəhd təyin edə bilsin. Xəlifənin şəxsən özü, özünü bu vəzifədən əzl edərsə, imamlıq vəzifəsi vəliəhdə keçər. Öz-özünü əzl etməsi isə, onun ölümü kimidir.

İmam, 2 şəxsi vəliəhd təyin etmişdirsə, birini digərinə tərcih etməmişdirsə, belə bir iş, doğru ola bilər. Onun vəfatından sonra, seçicilər heyəti, ikisindən birini başçı seçərlər. Ömər (radiyallahu anh)›ın, 6 şəxs haqqında tərəddüd etməsi, onlara vəliəhd olaraq işarət etməsi üzərinə şuranın imam seçməsi kimi.

İbn İshaqın Zühridən, onun da ibn Abbasdan bu vaqeəni nəql etdiyi deyilir:

Bir gün ibn Abbas, Öməri kədərli görür. Ömər, ona:

*«Xilafət işində nə edəcəyimi, yerimə kimi təyin edib geri çəkilib istirahət edəcəyimi bilmirəm.»* deyir.

- Bunun üzərinə, ibn Abbas:

*«Sənin üçün, Əli münasibdir»* deyir.

- Ömər:

*«Şübhəsiz ki, imamlıq üçün, Əli münasibdir. Lakin O, hələ bu xüsusda yaddır. Əgər idarə işləriniz ona verilərsə, təxmin edə biləcəyiniz bir haqq yolda, sizə bəzi yüklər yükləyər. Mən, elə görürəm.»*

- İbn Abbas:

*«Bəs, Osmanı necə?»*

- Ömər:

*«Mən onu xəlifəliyə namizəd göstərsəm, ibn əbi Muayt, insanlar arasında, onun arxasından hücuma keçər, Osmanı tənqid edər. Sonra*

*da, Osmanın boynunu vuruncaya qədər, Müsəlmanlar bu işə razı olmazlar. Allaha and içirəm ki, mən, onu xəlifə olaraq seçsəm, ibn əbi Muayt da dediyimi edəcək, Müsəlmanlar da, bir cinayətə qədər sürüklənmiş olacaq.»*

- ibn Abbas:

*“Bəs, Talha necə?”*

- Ömər:

*“Talha, bir az təkəbbürlü biridir. Halbuki Allah Taala, Muhamməd (sallallahu aleyhi və səlləm) ümmətinin işlərini idarə üçün, özünü böyük görənlərə izn verməmişdir.”*

- ibn Abbas:

*“Bəs, Zubeyr bu iş üçün necədir?”*

- Ömər:

*“O, cəsur biridir. Çox vergi alar, bazarlarda bolluq və darlığı gərəkdirən işlər görər. Belə birisimi Müsəlmanların işlərini idarə etsin?”*

- ibn Abbas:

*“Bəs, Sa’d b. əbi Vaqqas necə?”*

- Ömər:

*“O, burda yoxdur. Heç şübhəsiz ki, O, təchiz edilmiş bir dəvə sahibidir. Davamlı olaraq, onun üstündə döyüşür. Halbuki, dövlət işlərini idarə edəcək şəxs, belə olmamalıdır.”*

- ibn Abbas:

*“Elə isə, Abdu’r-Rahmən b. Avf?”*

- Ömər:

*"O, gözəl bir insandır. Nəzərimdədir. Lakin zəifdir. Allaha and olsun ki, bir xəlifə, belə olmamalıdır.*

*Ey ibn Abbas! Xəlifə, acizlik, zəiflik göstərməyən bir yumşaqlıqda olmalı, şiddəti tərk etməli, paxıl olmayan, lakini işini sağlam görən israfsız bir comərd olmalıdır."*

Ravi ibn Abbas deyir:

Əbu Lulu, Öməri yaraladığında, Öməri müalicə edən həkim Ömərin halından ümidsiz olunca, səhabələr ona:

*"Vəliəhd təyin et."* dedilər.

Ömər də, 6 nəfərlik şura qurdu və:

*"Əgər imamlıq Əliyə veriləcək olarsa, müqabilində Zubeyr; Osmana veriləcək olsa, qarşısında Abdu'r-Rahmən b. Avf; Talhaya veriləcək olsa, Sa'd b. əbi Vaqqas vardır."* dedi.

Ömərin vəfatından sonra, şura toplandı. Abdu›r-Rahmən b. Avf:

*"Başçılıq işinizi, içinizdən 3 nəfərə verin."* dedi.

- Zubeyr:

*"Mən, haqqımı Əliyə verirəm."* dedi.

- Talha:

*"Mən, haqqımı Osmanın lehinə istifadə edirəm*." dedi.

- Sa'd da:

*"Mən də, haqqımı Abdu'r-Rahmənə verirəm."* dedi.

Beləcə, 6 nəfərlik şura, adları keçən 3 nəfərə endi. Digər üçü, aradan çıxmış oldu. Bunun üzərinə, Abdu'r-Rahmən:

*"Hansınız imamlıq işinə ən münasibdir, onu imam qılaq? Topluluğun işlərinin doğruluğuna, yaxşılığına xidmətdə, Allah şahiddir."*

Abdu’r-Rahmənin sualına kimsə cavab vermədi. Abdu’r-Rahmən, təkrar:

*“Əgər məni imam edəcəksinizsə, mən, bu işdən geri çəkilirəm. Allah şahiddir ki, nəsihət etmək surətilə sizi aşağılamaq istəmirəm.”* dedi.

Beləcə, 6’dan 3’ə enən şura, Abdu’r-Rahmənin çəkilməsilə də, 2 nəfərə, yəni Osman və Əliyə endi.

Abdu’r-Rahmən, Müsəlmanlar arasındakı halı öyrənmək üzərə ordan ayrıldı. Gecənin qaranlığı çöküncə, Misvər b. Məhrəmə’ni çağırdı. Hansına biət ediləcəyi mövzusunda müzakirəyə başladılar. Allahın kitabı və Peyğəmbərin sünnəti ilə əməl və hərəkət edən ikisindən birinə biət edilməsini; biri digərinə biət edincə, xalqın da dinləyib itaət etməsi xüsusları haqqında danışdılar. Sonra Osmana biət olundu.

Beləcə, seçki heyəti tərəfindən seçilən birinin imamlığına biət, imamın vəliəhd surətilə də ola biləcəyinə dair, icma vaqe olmuşdur.

Ədədləri bəlli olduqdan sonra, seçki heyətinin 2 və ya daha çox kimsədən qurulmasında, bir fərq və məhzur (həzər ediləcək hal) yoxdur. Bu təqdirdə, qurulan seçki heyətindən birinin xəlifəliyə seçilməsi bəhs mövzusu olar və seçilərsə, digər bütün Müsəlmanların ona biət etməsi lazımdır. Bu yolla xəlifə olan biri, başqasını vəliəhd təyin edə bilər. Xəlifə, seçki üçün, bir seçicilər heyəti mahiyyətində məclis qurmuşdursa, hələ xəlifə sağ ikən bu məclis, içlərindən birini xəlifə olaraq seçə bilməz. Əgər xəlifə hələ sağdırsa, məclisin iləridə xəlifə olacaq şəxsi seçməsinə icazə vermişdirsə, əvvəldən seçki qurula bilər. Yoxsa həyatda ikən, onun bir şərikini seçə bilməzlər. Xəlifənin ölümündən sonra, işlərin büdrəməsindən qorxulursa, məclis, xəlifədən icazə alar, sonra gələcək xəlifəni əvvəlcədən seçə bilərlər.

Xəlifə, müalicəsi çətin bir xəstəliyə tutulmuşdursa, baxılar. Əgər

əmr etmə qüdrəti, düşünmə qabiliyyəti qalmamışdırsa, ölmüş qəbul edilir və bir xəlifə seçilir. Belə hərəkət etmədə, hər hansı bir məhzur yoxdur. Düşünə bilmə, yaxşı və pisi ayırd etmə qüdrəti mövcuddursa, seçicilər heyəti, ancaq xəlifənin icazəsilə bir xəlifə seçərlər.

İbn İshaqdan nəql edildiyinə görə, Ömər, yaralı olaraq evinə gətirildiyində, çöldən yüksək bir səs eşitdi və:

*"Xalqa nə olur?"* dedi.

- Ətrafındakılar:

*"Sizi ziyarət etmək istəyirlər. Onlara icazə verin."* dedilər.

Xalq içəri girincə, hamısı bir ağızdan:

*"Ey möminlərin əmiri! Vəliəhd təyin et, Osmanı imam et."* dedilər.

- Ömər:

*"Mal və cənnət, birlikdə necə sevilə bilər?"* dedi.

Xalqı, Ömərin yanından çıxardılar.

Xəstə xəlifə, çöldən yenə yüksək bir səs eşitdi və:

*"Xalqa nə olur?"* dedi.

- Ətrafındakılar:

*"Sizi ziyarət etmək istəyirlər. İcazə versəniz, içəri girərlər."* dedilər.

- Xalq:

*"Əlini imam qılın!"* dedi.

- Ömər:

*"Haqq yolda sizə yük yükləmiş olar."* dedi.

Bu söhbət üzərinə, Abdullah b. Ömər:

*"Xalqı susdurdum. Ey möminlərin əmiri! Sizi belə bir təyindən əngəlləyən nədir?"* deyə soruşdum.

- Atam:

*“Xilafəti mənə, həm diri və həm də ölü ikənmi yükləmək istəyirsiniz?”* dedi.

Bu hadisələrdən varılan nəticə budur ki, xəlifənin, məqbul vəliəhd təyin etməsi, bunun üçün bir heyət təsbit etməsi, hüquqi olaraq məqbul olduğu kimi, yalnızca seçicilər heyətini təsbiti də məqbuldur. Bu hallarda, xəlifənin göstərdiyi kimsələrdən birini seçmək lazımdır. Eynilə, vəliəhd təyin edilənin, seçicilər heyətincə qəbul edilməsi kimi. Çünki vəliəhd təyinini və ya seçicilər heyətindən birinin təyinini istəmək, xəlifənin xilafət haqlarındandır.

**J. Birdən çox vəliəhd təyini**

Bu başlıq altında, xəlifənin birdən çox vəliəhd təyin etməsi və xəlifəliyin aralarında sıraya qoyulması məsələləri incələnəcəkdir.

Xəlifə, 2 və ya daha çox şəxsi vəliəhd təyin edərsə, xilafəti aralarında bir sıraya qoyarsa, məsələn, “*Məndən sonra xəlifə, filankəsdir. Əgər o ölərsə, onun ölümündən sonra filankəsdir. Onun ölümündən sonra da filankəsdir.”* deyərsə, belə bir təyinat, caizdir. Xilafət, hər üçünə də, sırası ilə keçər.

Allah rəsulu (sallallahu aleyhi və səlləm), Mutə ordusuna Zeyd b. Harisə’ni komandir təyin etdiyində, *“Əgər o, şəhid olarsa, komandir Cəfər b. əbi Talibdir. O da şəhid olarsa, komandir Abdullah b. Rəvaha’dır. O da şəhid olarsa, Müsəlmanlar, öz aralarında birini komandir seçsinlər və ona razı olsunlar.”*[1] buyurmuşdur.

Zeyd başa keçmiş, şəhid olunca, sancağı, Cəfər dövr almış, o da şəhid olunca, Abdullah b. Rəvaha komandir olmuşdur. O da şəhid olunca, Müsəlmanlar Xalid b. Vəlidi komandir təyin etmişdilər.

1 (Buxari, Cihad/7)

Allah rəsulu (sallallahu aleyhi və səlləm), hər nə qədər hərb komandirliyində belə bir təsərrüf etmişsə də, eyni hal, xilafət üçün də bəhs mövzusu ola bilər.

Ancaq bir etiraz olaraq, *“Xilafət, sifət və şərtə görədir. Komandirlik isə, sifət və şərtə bağlı deyildir.”* fikri iləri sürülərsə, cavab olaraq deyilər ki:

Bütün bunların hamısının hökmləri xüsusi, tətbiqatı isə, ümumidir. Çünki xilafət işi, toplumun bütününü maraqlandıran bir işdir. Əməvilər və Abbasilərdə bu şəkildə olmuş, zamanın alimləri, dəlil qəbul edilən hədisi inkar edərək, bu hərəkətə qarşı çıxmamışlardır. Tarixdə ilk belə tətbiqat, Əməvilərdə olmuşdur.

Əməvi xəlifəsi Süleyman b. Əbdi›l-Məlik, Ömər b. Əbdi›l-Əziz›i vəliəhd təyin etmiş, ondan sonra da, Yezid b. Əbdi›l-Məliki vəliəhd göstərmişdir. Süleyman üçün bir hüquqi dəlil olmasaydı, müasirləri olan Tabiun alimlərinin tənqidləri olardı. Halbuki belə bir tənqid olmamış, onun bu tətbiqatı da dəlil olaraq alınmışdır.

İkinci tətbiqat isə, Abbasi xəlifələrindən Harun ər-Rəşid zamanındadır. O da, oğullarından, ilk əvvəl Əmin, sonra Mə’mun, sonra da Mu’təmən’i, zamanın böyük alimlərilə danışaraq, vəliəhd təyin etmişdir.

Bundan da anlaşıldığı üzərə, xəlifə, 3 şəxsi, vəliəhd təyin edər, xəlifəliyi aralarında bir sıraya qoyar. Hər üçü də sağ ikən ölərlərsə, xəlifənin ölümü üzərinə, xilafət məqamına ikinci vəliəhd keçər. Birinci və ikinci vəliəhdin hər ikisi də, xəlifənin sağlığında ölərlərsə, xəlifənin vəfatından sonra üçüncü vəliəhd xəlifə olar. Çünki hər biri üçün xəlifəlik, vəliəhd təyini surətilə olmuşdur.

Xəlifə ölər və hər 3 vəliəhd də sağ olarlarsa, xilafət vəzifəsi ilk vəliəhdə keçər.

“Əgər ilk vəliəhd bu vəzifəni özündən sonrakı 2 vəliəhdin xaricində birini vəliəhd təyin etmək surətilə xəlifəliyi ötürmək istəsə, bunun hüquqiliyi nədir?” sualına, fəqihlər fərqli cavablar vermişlərdir:

**a.** Fəqihlərdən bəziləri: Sıraya tabe olmağın bir gərəyi olaraq, belə bir təyin işini doğru görməmişlərdir. Əgər könül xoşluğu ilə, özündən sonrakı vəliəhdlər, xəlifəlikdən vaz keçirilə bilsələr, gördüyü iş məqbul sayılır.

Əbu›l-Abbas əs-Səffah, Mənsuru vəliəhd təyin etmiş, ondan sonra da İsa b. Musanı təyin etmişdi. Mənsur sultan olunca, Mehdini İsaya tərcih etmək istəmişdi. İsanı vəliəhdlik haqqından vaz keçirərək, sıradan çıxardı. Zamanın fəqihləri də*, “Könül xoşluğu ilə vəliəhdlikdən vaz keçilib sıradan çıxıncaya qədər edilən yeni vəliəhd təyini, hüquqən mötəbər deyildir. Vaz keçildikdən sonra isə, hüquqi olaraq bir məhzur yoxdur.”* demişlərdir.

**b.** Şafii məzhəbinə və fəqihlərin əksəriyyətinə görə: Bilinən xüsus, vəliəhd surətilə xilafət vəzifəsinə başlayan şəxsin, özündən sonrakı vəliəhdlərin sırasına tabe olmadan, vəliəhd təyin edə bilər. Bu hal qarşısında, yeni tərtibə görə, xəlifənin vəfatından sonra, vəliəhdlər xilafət vəzifəsini icra edərlər. Xilafət vəzifəsi, hala görə qoyulan sıradakı vəliəhdlərə verilər. Bundan dolayı, əvvəlki sıra, sonrakı xəlifələr tərəfindən yenidən dəyişdirilə bilməkdədir. Çünki xəlifəlik vəzifəsi, ammə işlərindəndir. Əmrləri, qəti hökm ifadə edər. Başdakı xəlifənin haqqı qüvvətli, vəliəhd təyini də məqbuldur. Lakin bu hərəkət tərzi, Peyğəmbər (sallallahu aleyhi və səlləm)’in Mutə döyüşündəki komandir təyinindəki hədisin tətbiqatına zidd düşməkdədir. Çünki gördüyümüz kimi, Peyğəmbər (sallallahu aleyhi və səlləm), həyatda ikən, belə bir vaqeə olmuş, vəzifə, ancaq, birinin vəfatından sonra digərinə keçmişdir. Bu cəhətdən, komandirlikdəki tətbiqat ilə, xəlifəlikdəki vəliəhd

təyini bir-birində ayrılmışdır. Xəlifə Mənsurun, İsa b. Musanı vəliəhdlik sırasından çıxarmasından məqsəd, hələ dövlət yeni qurulmuş, qəbiləsindəki fərdlər arasında, əhliyyət yönündən bir bərabərlik mövcud idi. Fərdlər arası münasibəti təmin etmək üçün belə etmişdir. İsa b. Musanın yaşı az, siyasətə qarşı qabiliyyəti də az idi. Bu hal qarşısında xilafət, başqasına keçə bilməkdədir.

3 vəliəhdin 1-cisi, xilafət vəzifəsini yerinə yetirdikdən sonra ölmüş və özündən sonra da bir vəliəhd təyin etməmişdirsə, 2-ci vəliəhd, xəlifə olar. İkincisi də vəliəhd təyin etmədən ölərsə, 3-cüsü xəlifə olar. Birinci haqqındakı vəliəhdlik, qəti bir hökm ifadə edər. Lakin 2-ci və 3-cünün xəlifə olmaları, özlərindən əvvəlkilərin təsərrüflərinə bağlıdır. Çünki bir öncəki, özündən sonra bir başqasını vəliəhd təyin edərsə, sırada gözləyən 2-ci və 3-cü vəliəhdlərin xəlifə olmaları, imkansız və ya çətin bir hala gələr.

Bax bu görüşə görə, ilk sıradan ayrılmaq caiz və mümkündür. Nəticə olaraq, 2-ci və 3-cü vəliəhdlərin imam ola bilmələri, vəliəhd təyin edilməməsilə mümkündür.

Əgər 3 vəliəhddən 1-cisi imamlıq vəzifəsini yerinə yetirib vəliəhd təyin etmədən vəfat edərsə, seçicilər heyətinin, 2-ci vəliəhdin xaricində bir başqasını seçmələri doğru deyildir.

Eyni şəkildə, 2-inci də bir vəliəhd təyin etmədən ölərsə, seçicilər heyəti 3-cü vəliəhdin xaricində bir başqasını imam seçə bilməzlər. Hər nə qədər 2-inci vəliəhd imam olunca, 3-cünün xaricində birini imamlığa vəliəhd olaraq göstərə bilirsə də, seçicilər heyətinin, belə bir haqqı yoxdur. Çünki vəliəhd təyini, qətidir. Haqqında hüquqi dəlil vardır. Seçicilər heyəti, belə bir haqqı istifadə edə bilməz.

Lakin vəliəhd təyin edən xəlifə, *«Filankəsi vəliəhd təyin etdim.»* desə, *«O da xəlifəlik vəzifəsini yerinə yetirdikdən sonra xilafət, filan*

*şəxsindir.»* desə, ikincinin xəlifəliyi mötəbər deyildir. Səbəbi isə, ikincinin vəliəhdliyini və xəlifəliyini, birincinin xilafət vəzifəsini yerinə yetirməsinə bağlamışdır.

Əgər birincisi xəlifə olmadan ölərsə, şərt gerçəkləşmədiyindən, ikinci vəliəhd xəlifə ola bilməz; olsa, xilafəti batildir. Birinci, xəlifə olunca, o da daha əvvəl görüldüyü kimi, özündən sonra bir başqasını vəliəhd təyin edə bilməkdədir. Əgər birincisi xəlifəliyi yüklənmədən ölərsə, onun vəfatından sonra, seçicilər heyəti, başqasını xəlifə olaraq seçə bilərlər.

**K. Xəlifəyə itaət və xəlifənin vəzifələri**

Seçkilə və ya vəliəhdlik surətilə xəlifəliyi qətiləşmiş olan birinin mövcud olduğunu bilmək, bütün İslam toplumunun vəzifəsidir. Şəxsini, adını, xüsusi hallarını bilmək isə, yalnız seçicilər heyəti üçün şərtdir. Çünki onlar, o şəxsi xəlifə seçəcəklər, biət edəcəklər. Süleyman b. Cərir isə:

*«İnsanların hamısına, Allah və Rəsulunu bilmək kimi, xəlifənin zatını və adını bilmək, vacibdir.»* demişdir.

Alimlərin əksəriyyətinə görə, xəlifə haqqında mücməl məlumat sahibi olmaq, hər kəs üçün gərəklidir; geniş məlumata ehtiyac yoxdur. Ancaq xəlifəyə xüsusi bir işi düşənin, xəlifənin ismini və şəxsini bilməsi lazımdır. Necə ki, hakimləri, müftiləri, onlara işi düşməyən, ümumi olaraq bilir. İşi, soruşacağı hər hansı bir məsələsi olanlar, xüsusi olaraq bilirlər. Bu hal, xəlifə üçün də belədir. Əgər *«Topluluğun hər fərdinin dövlət başçısının şəxsini, ismini, cismini, xüsusi hallarını bilməsi lazımdır.»* şərti qəbul ediləcək olarsa, o təqdirdə, hökümət mərkəzinə, yaxında və uzaqda olan hər kəsin getməsi, görməsi, danışması lazımdır. Bu hal, ixtilaflara, çətinliklərə səbəb olar, adətə müxalif bir hal ərz edər. Lakin *«Ümumi məlumat, kifayətdir»* şərti qəbul edilərsə,

bəzilərinin verdiyi məlumat, vəkalət olaraq göndərilənlərin geri qayıtdıqları vaxt söyləyəcəkləri xüsuslar, kifayət edir.

İslamda, dövlət başçısına, xəlifə deyilmişdir. Çünki topluluğu sövq və idarədə, Peyğəmbər (sallallahu aleyhi və səlləm)›ə xələf olmuşdur. Bundan dolayı, *«Ey Peyğəmbərin xəlifəsi»* deməkdə, bir məhzur yoxdur. *«Xəlifə»* termini, ümumi olaraq istifadə edilir.

**«Ey Allahın xəlifəsi» deməyin uyğun olub-olmayacağı xüsusunda,** 2 fikir vardır:

**a.** Belə bir sözün istifadə edilməsində bir beis görməyənlər:

*«İnsanlar arasında Allahın haqq və qanunlarını ayaqda tutduqlarından dolayı, Allahın xəlifəsi termini istifadə edilə bilər.»* deyirlər. Bunun Qurandan dəlillərinə gəlincə:

وَهُوَ ٱلَّذِى جَعَلَكُمْ خَلَٰٓئِفَ ٱلْأَرْضِ وَرَفَعَ بَعْضَكُمْ فَوْقَ بَعْضٍ دَرَجَٰتٍ لِّيَبْلُوَكُمْ فِى مَآ ءَاتَىٰكُمْ ۗ إِنَّ رَبَّكَ سَرِيعُ ٱلْعِقَابِ وَإِنَّهُۥ لَغَفُورٌ رَّحِيمٌ

*«Verdiyi nemətlərlə sınamaq üçün, sizi yer üzünün xəlifələri təyin edən, birinizi digərinizin fövqünə dərəcə-dərəcə qaldıran, Odur. Həqiqətən, sənin Rəbbin tezliklə cəza verəndir. Həqiqətən, O, Bağışlayandır, Rəhmlidir.»*[1] ayətidir.

**b.** Alimlərin əksəriyyəti isə:

*«Belə bir sözün deyilə bilməyəcəyi, söyləyənin fisq və günah, pislik sahibi olduğu; ancaq ölən və ya yoxa çıxanın xələf qoyula biləcəyi;*

1 (Ənam/165)

*Allahın isə, əsla ölən və ya yoxa çıxan biri olmadığından dolayı, bu sözün söylənə bilməyəcəyi»* fikrindədirlər.

Əbu Bəkr (radiyallahu anh)›a: *«Ey Allahın xəlifəsi!»* deyə səslənildiyində, o, dərhal, cavab olaraq: *«Mən, Allahın xəlifəsi deyiləm. Lakin Allah rəsulunun xəlifəsiyəm.»* demişdir.

**Xəlifənin görəcəyi əhəmiyyətli olan ammə işləri, 10'dur:**

**1.** Vaz olunan (qoyulan) qaydalara, sələfin icma etdiyi xüsuslara uyğun olaraq, dini qorumaq, mühafizə etməkdir. Din haqqında şübhəsi olan, bir bidət əhli kimlərsə çıxarsa, ona, hər şeyi dəlilləri ilə açıqlayar və doğru yolu göstərər. Gərəkli cəzaları tətbiq edər. Çünki onun vəzifəsi, fəsaddan, pozulmaqdan qorumaq, xalqı pisliklərdən, bayağılıqlardan uzaqlaşdırmaqdır.

**2.** İxtilaflıların ixtilaflarını həll etməkdə; çəkişmələrə (bir çəkişmə içində olan adamların çəkişmələrinə) son qoymaqda; mərhəmətin təminində, dinin hökmlərini tətbiq edər. Beləcə, zalım, azğınlıq edə bilməz; məzlum da zəif salınmaz.

**3.** Topluluğu himayə, qorumaq, mal, can və hər cür yol təhlükəsizliyini təmin etmək surətilə, insanların yer üzündə yaşayışlarını, qazanc əldə etmələrini təmin edər. Qadağan olan sahələrdən və başqasına aid haqlara zərər verməkdən uzaqlaşdırar.

**4.** Allahın qoyduğu əmr və qadağaları, eynilə tətbiq etmək; bu hökmlərin dəyişdirilmələrinin qarşısına keçmək; insanların haqlarının ortadan qalxmasını əngəlləmək; haqları qorumaq uğrunda cəzalar tətbiq etmək.

**5.** Müsəlmanların, zimmilərin və müsəlmanlarla razılığları olanların qanlarına, həyatlarına, mallarına qəsd etmək istəyən; dini ortadan qaldırmağa təşəbbüs edən düşmənə qarşı hərb hazırlıqları etmək; toplumun müdafiəsi üçün qalalar, əngəllər inşa etdirmək.

**6.** İslamın bütün dinlərə üstün olduğu mövzusunda lazımi isbatlar etmək; Allahın və toplumun haqqının ayaqda tutulması üçün, dəvətə rəğmən Müsəlman olmayan kimsələrə qarşı İslama girincəyə və zimmiliyi qəbul edincəyə qədər döyüşmək.

**7.** Qorxu hiss etdirmədən, zülm və təzyiq meydana gətirmədən, dincə və ictihadca üzərlərinə fərz olan kimsələrdən zəkat və digər vergiləri, qənimətləri toplamaq.

**8.** İsraf və paxıllıq etmədən, xəzinədən, layiq olanlara tam vaxtında yardımlar etmək;

**9.** Vergilərin toplanması, xalqa nəsihətin təmin edilməsi üçün, təhlükəsizlik məmurları, nəsihətçilər təyin etmək, vəzifələndirməkdir. Bundan məqsəd, hər kəs üçün işlər bərabər və sağlam bir şəkildə icra edilsin, mallar təhlükəsizlik içində qorunsun;

**10.** Topluluğun işləri və halları ilə şəxsən məşğul olmaq, bunları qətiyyətlə izləmək. Beləcə, xalqın idarəsi, millətin himayəsi, daha yaxşı təmin edilər; xilafət vəzifəsini, yalnız əyləncələrlə və ya yalnız ibadətlərlə ehmal etməmiş olar. Təyin etdiyi məmurlar, xainlik edə bilər, vəzifələrini axsada bilərlər. Allah Taala da:

يَٰدَاوُۥدُ إِنَّا جَعَلْنَٰكَ خَلِيفَةً فِى ٱلْأَرْضِ فَٱحْكُم بَيْنَ ٱلنَّاسِ بِٱلْحَقِّ وَلَا تَتَّبِعِ ٱلْهَوَىٰ فَيُضِلَّكَ عَن سَبِيلِ ٱللَّهِ ۚ إِنَّ ٱلَّذِينَ يَضِلُّونَ عَن سَبِيلِ ٱللَّهِ لَهُمْ عَذَابٌ شَدِيدٌۢ بِمَا نَسُوا۟ يَوْمَ ٱلْحِسَابِ

*«Ey Davud! Biz səni yer üzündə xəlifə təyin etdik. Elə isə insanlar arasında ədalətlə hökm ver, nəfsin istəyinə uyma, yoxsa o səni Allahın*

*yolundan azdırar. Həqiqətən, Allahın yolundan azanları Hesablaşma gününü unutduqları üçün şiddətli bir əzab gözləyir.»*[1] buyurmuşdur.

Allah, yalnız nəfsə uymağı, dəlalətlə vəsfləndirmişdir. Xilafət vəzifəsi, bu şəkildə sarsılmış olur.

Layiq olan, bu məqama keçincə, dinin hökmlərini, xilafət məqamını qoruması lazımdır. Peyğəmbər (sallallahu aleyhi və səlləm) də:

*«Hamınız çobansınız və hamınız, sürünüzdən məsulsunuz.»*[2] buyurmuşdur.

Şair də, şərəfli, çalışqan bir xəlifəni belə vəsf edir:

*«İşlərinizi görəcək olanlara verin, təyin edin, nə yaxşılığınız varsa, Allahadır. Rifah və səadətin bolluğu, hər yerə yetişən əllərin, əmirlərin sayəsindədir.*

*Həyat, hər cür rifaha izn versə də, dünyada bol bir nemət yoxdur. Əmr sahibləri məcbur etsələr də, onlara əsla huşu edilməz.*

*Zamanın xeyir yönündən hər şeyini sağdılar, bəzi şeylər saydılar. O insanlar, bir gün birinə tabe oldular, bir gün də birinə.*

*Gedişatı qəzəbli bir şəkildə davam etsə də, görüşü qüvvətli, fikirləri çox isabətli olan kimsə üçün, lovğalanmaqda bir zəlillik yoxdur."*

Muhamməd b. Yəzdad da, vəziri olduğu Xəlifə Mə'muna belə yazırdı: *"Kim dünyanı arzu edərsə, insanların hamısı yuxuda ikən, yatmamaq şərtilə arzusuna çatar. İşlərini həll etməyi, bir an əvvəl nəticəyə çatmağı çox arzu edən, necə olur ki, zəif düşüb uzun bir yuxuya varır, gözlərini bağlayır?!"*

---

1 (Sad/26)

2 (Buxari, Cümə/11)

**L - Xəlifə olmağa mane olan hallar**

**Xəlifə, cəmiyyətin haqlarını, öz vəzifələrini necə yerinə yetirər?**

Xəlifə, yuxarıda sayılan ictimai vəzifələrini yerinə yetirərkən, Allahın haqlarını hər şeydən əvvəl əda edər. Xəlifə, halını pozmadığı müddətcə, topluluğun ona itaət etməsi, köməklik göstərməsi məcburidir. Bunlar da, topluluq üzərində xəlifənin haqqı, toplumun da vəzifəsidir.

Halını dəyişdirən xəlifəni, xilafət məqamından endirən, 2 şərt vardır:

**1.** Ədalətdən ayrılması;

**2.** Bədəninə nöqsanlıqların gəlməsidir.

**a.** Ədalətdən ayrılması, bu yöndən (yəni ədalət yönündən) tənqid edilməsi, yaralanması, onun xarablığı və fisqi səbəbilədir. Bu da, ikiyə ayrılır:

**aa.** Şəhvətə düşkünlüyü, nəfsinin arzularına uyması;

**bb.** Şübhə çəkici işlər görməsi.

**aa.** Şəhvətini qüvvətləndirmək, arzularına boyun əymək surətilə pis işlər görməyə, qadağan edilən şeyləri etməyə başlamasıdır. Bunlar, bədənə aid fellərdir. Belə bir hal, xilafət əqdinin meydana gəlməsinə əngəldir. Xəlifə olduqdan sonra, bu cür işlər görərsə, o məqamdan çıxmış, xilafət vəzifəsini zədələmiş olar. Əvvəlki yaxşı halına, doğruluğuna qayıtsa da, artıq məqbul sayılmaz. Yenidən təkrar xəlifə seçilərsə, nə gözəl.

Kəlam alimlərinin bəziləri də, *“Ədalət və doğruluğa qayıdarsa, xilafətdən ayrılmamış, olar. Bunun təməl səbəbi isə, təkrar ediləcək biətin çətin olması, ammə işlərinin axsamamasıdır. Əvvəlki biətin davam etməsi nəticəsində, xəlifə olaraq qalar.”* deyirlər.

**bb.** Şübhə çəkən işlər isə:

İnancla bağlı şübhəli hərəkətləri olub, bunlar, haqq olana zidd düşürsə, belə hallarda, işlər təvili və ya təvilsiz olaraq fisqini, xarab etiqadını gərəkdirirsə, bu halda xəlifə kafir olmuş sayılır, bu, onun küfrünə bərabər bir haldır. Belə inanclarında davam edərsə, xilafət məqamında qala bilməz. Vəzifəsi bitmişdir.

**bbb.** Basra alimlərinin bir çoxuna görə isə, məhkəmə işlərini icra etmədə, şahidlik edə bilmədə, bu cür hərəkətlər bir əngəl olmadığı kimi, xəlifəliyinə də mane olmaz, vəzifədən də uzaqlaşdırılmaz.

**b.** Xəlifənin bədənində meydana gələn şikəstliklər də, 3 qismə ayrılır:

**aa.** Beş hissində və ağlındakı nöqsanlıqlar;

**bb.** Orqanlarındakı nöqsanlıqlar;

**cc.** Hüquqi təsərrüflərindəki nöqsanlıqlar.

**aa.** 5 hissindəki (görmək, eşitmək, dadmaq, toxunmaq, qoxu hisləri) nöqsanlıqlar da, 3 qisimdir:

**aaa.** Bir qismi xilafətə əngəldir;

**bbb.** Bir qismi xilafətə əngəl olmaz;

**ccc.** Bir qismi haqqında da ixtilaf mövcuddur.

**aaa.** Xəlifəliyinə əngəl olan nöqsanlıq: görməsini və ağlını itirməsidir.

Ağıl itirmək də, öz içində ikiyə ayrılır:

**1.** Arizi (gəlib-keçici) ağıl xəstəliyi ki, irəlidə müalicəsi mümkündür. Özündən getmək kimi. Belə bir ağıl xəstəliyi, xəlifə olmağa əngəl meydana gətirmədiyi kimi, xəlifəlikdən çıxmağa səbəb təşkil edici də

deyildir. Çünki müalicəsi mümkündür. Peyğəmbər (sallallahu aleyhi və səlləm) də, ölüm xəstəlikləri sırasında buna məruz qalmışdı.

**2.** Bu qrupdakı ağıl xəstəliyi, dəlilikdir. Müalicəsi və keçməsi ümid edilməyən bir xəstəlikdir. Bu da, ikiyə ayrılır:

**2.1.** Tam bir ağıl xəstəliyidir ki, qurtulması imkansızdır. Belə bir xəstəlik, həm xəlifə olmağa, həm də xəlifəliyin davamına manedir. (Bununla) Xilafət batil olmuşdur.

**2.2.** Xəstəliyin müalicə nəticəsi irəlidə keçməsi mümkün, xəstəliyin şəfası umulursa, o vaxt baxılar:

~ Əgər dəlilik zamanları ağıllılıq zamanlarından çoxdursa, xəstəlik davam etmiş sayılır. Xilafətə və xilafətin davamına əngəldir.

~ Əgər ağıllılıq halı, dəlilik halından çoxdursa, bu hal, xəlifə olmağa mane, xəlifəliyin davamına isə, mane deyildir.

Fəqihlərin bəzilərinə görə, xəlifəliyin davamına da manedir.

Əgər mane deyildir deyilərsə, bu işə layiq olanın haqqı ixlal edilmiş (haqqına xələl gətirilmiş) sayılır.

Bir qisim fəqihlər də, belə bir ağıl xəstəliyi hər nə qədər başlanğıcda xəlifə olmağa əngəlsə də, xəlifəliyi anında ortaya çıxan bu cür xəstəlik, xəlifəliyin davamına əngəl deyildir. Xəlifəlik əqdinin başlanğıcında, ilk meydana gəlişində tam bir əqli kamillik istənilir. Xəlifəlikdən çıxmaq da, tam bir ağıl xəstəliyi ilə olur.

Gözdəki nöqsanlığa, görmə hissinin itməsinə təmas etməli olsaq, görməyənlərin hakimliyi, şahidliyi necə məqbul və mötəbər deyildirsə, belə bir şəxsin xəlifə olması və ya bu vəzifəyə davam etməsi də, məqbul deyildir. Gözün gecə görməməsi, xəlifə olmağa və xilafətin davamına əngəl deyildir. Çünki bu növ xəstəlik, müəyyən bir zamana məxsus, müalicəsi mümkün bir xəstəlikdir. Görmə zəifliyinə gəlincə:

Əgər adamları gördüyündə tanıya bilirsə, xəlifəliyə əngəl deyil; şəxsləri başa düşür, lakin kim olduğunu bilə bilmirsə, bu, xəlifə olmağa və xəlifəliyin davamına əngəl təşkil edir.

**bbb.** 5 hissindəki nöqsanlıqlarından ikinci növü, xəlifəliyə əngəl deyildir. Bunlar da, burunda qoxu almağa, qoxuları ayırd etməyə mane bir xəstəliklə; dad alma hissinin olmamasıdır. Hər ikisi də, insanın zövqünə, ləzzətinə təsir edir. Görüş, fikir və hərəkətlərinə təsir etməz. Bu cəhətdən, xəlifə olmağa əngəl deyildir.

**ccc.** 5 hisdəki nöqsanlıqlarında ixtilaf mövzusu olan şey, ikidir: Bunlar da, karlıq və lallıqdır. Bu 2 nöqsanlıq, xəlifə olmağa qəti olaraq əngəldir. Çünki xəlifə olacaq şəxsin bütün sifətlərində mükəmməl olması lazımdır.

Lakin bu 2 nöqsanlığın xilafət vəzifəsindən çıxarmaq mövzusundakı təsirində ixtilaf mövcuddur:

**1.** Bir qrupa görə, işlərin tam olaraq icrasına, sövq və idarəyə təsir etdiyindən, karlıq və lallıq, xilafətdən çıxarar.

**2.** Digər bir qrupa görə də, bəzi işarətlər, dil və qulaq yerinə keçəcəyindən, dilsizlik və karlıq, xəlifəni xəlifəlikdən çıxarmaz.

Ancaq tam bir nöqsanlıq, xilafətin davamına manedir. Bunlar isə, tam bir nöqsanlıq sayılmaz.

**3.** Bu görüşə görə, xəlifə yazı yazmağı bilirsə, lallıq və karlıq, xəlifəlik vəzifəsinin davamına mane deyildir; yazı yazmağı bilmirsə, manedir. Çünki yazı ilə məqsədin nə olduğu, açıqca ifadə edilə bilər. İşarətlərdə isə, şübhə vardır.

Karlıq və lallıq mövzusunda birinci görüş, ən isabətli olanıdır. Kəkələmək, pəltəklik, ağır eşitmək, səsləri eşidə bilir, xəbər verə bilirsə, xəlifəlik vəzifəsindən çıxarıcı nöqsanlıqlar sayılmaz.

Xəlifə olmadan əvvəl var olan pəltəklik və ağır eşitməyin xəlifə olmağa mane olduğunu söyləyənlər olduğu kimi, mane olmadığını da söyləyənlər vardır.

İkincilərin dəlili: Musa (əleyhissəlam)›ın dilinin pəltək olmasıdır. Peyğəmbərliyə əngəl olmayan bu hal, xəlifə olmağa əvləviyyətlə əngəl deyildir.

**M. Xəlifənin zədələnməsi**

Xəlifənin, orqanlarını itirməsi halı, 4 qismə ayrılır:

**a.** Xəlifə olmağa və davamına mane olmayan nöqsanlıqlar. Bunlar, düşünməyə, hərəkət etməyə, ayaqda durmağa, görünüşə təsir etməyən şeylərdir. Cinsiyyət orqanı və xayaların kəsilməsi kimi. Belə bir nöqsanlıq, xəlifə olmağa və xəlifəliyin davamına əngəl deyildir. Bunlar, uşaq meydana gətirməyə təsir edicidir. Düşünməyə, təcrübəyə təsir etməz. Bu cür bir əskiklik, xədimlik kimi muamələ görər. Allah Taala, Yəhya b. Zəkəriyyə (əleyhissəlam)'ı bu şəkildə vəsf etmiş və bu ayət ilə tərifləmişdir:

...أَنَّ ٱللَّهَ يُبَشِّرُكَ بِيَحْيَىٰ مُصَدِّقًۢا بِكَلِمَةٍ مِّنَ ٱللَّهِ وَسَيِّدًا
وَحَصُورًا وَنَبِيًّا مِّنَ ٱلصَّـٰلِحِينَ

*"Allah səni, Allah tərəfindən olan Kəliməni təsdiq edən, qövmünün ağası, nəfsinə hakim və əməlisalehlərdən bir peyğəmbər olacaq Yəhya ilə müjdələyir."*[1] **(Haşiyə)**

---

1 (Al-i İmran/39)

**(Haşiyə)** حَصُورًا Hasuran: "Nəfsinə hakim" demək olan bu kəlimə, əslində, "uzaq tutmaq, həbs etmək" mənasına gələn "əl-hasr" kəlimәsindən meydana gəlmişdir. Bir şeyin əngəl olub uzaq qoymağını bildirmək üçün, bu fel istifadə edilir.

• Fərci dar olan dişi dəvəyə də deyilir.

«əl-hasur» isə: «sanki onlardan əngəllənib uzaq tutulmuşcasına, qadınlara yaxınlaşmayan kimsə» deməkdir.

Bu izahı, əbu Amr vermişdir

• Quran-i Kərimdə də, uca Allah, belə buyurmaqdadır

...وَجَعَلْنَا جَهَنَّمَ لِلْكَٰفِرِينَ حَصِيرًا

“Biz cəhənnəmi, kafirlər üçün zindan (hasir) qıldıq.” (İsra/8

• “Hasir” eyni zamanda: “hökmdar” deməkdir. Çünki başqalarının görə bilməyəcəyi yerdədir

Yəhya (əleyhissəlam), hasur (nəfsinə hakim qılınmış) idi. Yəni qadınlara yaxın durmazdı. Sanki kişilərdə mövcud olan özəlliklərdən uzaq tutulmuş kimi idi.Bu açıqlama şəkli, ibn Məsud və başqalarından nəql edilmişdir.

• Yenə

• ibn Məsud• ibn Abbas• ibn Cubeyr• Ata• əbu’ş-Şa’sa• əl-Həsən• Süddi; v• ibn Zeyd belə deyirlər

“Hasur”: (cinsi) iqtidar sahibi olmaqla bərabər, qadınlardan uzaq duran və onlara yaxınlaşmayan kimsə, deməkdir.

2 səbəb dolayısı ilə, bu, bu mövzudakı görüşlərin ən səhih olanıdır

• Birinci səbəb: bunun, Yəhya (əleyhissəlam) üçün tərif olmasıdır. Tərif isə, əksəriyyətlə, insanın özündə mövcud olan üçün deyil, sonradan qazanılan bir fel üçün bəhs mövzusu olur

• İkinci səbəb: Dildə (hasur kəliməsinin vəzni olan) «fəul» vəzni isə, fail haqqında istifadə edilən əmr qəliblərindəndir. Şairin bu beytində olduğu kimi

“Qılıncın ucu ilə onların (dəvələrin) ən ətlilərinin ayaqlarını (kəsmək üçün) çox dəfə vuransan

Qıtlıq dolayısı ilə, azuqə tapa bilmədikləri təqdirdə, sən, dəvələri boğazlayansan.

Buna görə, “hasur” kəliməsinin əsl mənası: öz nəfsini şəhvətlərdən uzaq tutub cilovlayan kimsədir.

Bəlkə də, Yəhya’nın şəriətində elə idi. Bizim (İslam) şəriətində isə, əsl olan, nikahdır

• «Hasur»un: “evlənməsi umulmayan, mənisi gəlməyən, fərci (cinsiyyət orqanı) olmayan” mənasına gəldiyi də söylənilmişdir

Xədimlik xüsusunda 2 görüş vardır:

~ İbn Məsud və ibn Abbasa görə: Qadınla cinsi münasibətə imkan verməyən xədimlik;

~ Səid b. Müsəyyəb'ə görə də, kişilik və qadınlıq üzvü bir-birinə qarışmış və ya kiçik nöqtə, çəyirdək şəklində cinsi üzvü olan şəxs.

Hər 2 hal da, Peyğəmbərliyə əngəl olmadığı kimi, xəlifə olmağa da əvləviyyətlə əngəl deyildir.

Qulaqların kəsilməsi də belə olub düşünmə və hərəkətə mane deyildir. Gizlənməsi mümkün bir nöqsanlıqdır.

**b.** Bu qrupdakı nöqsanlıqlar, xəlifə olmağa və davamına əngəl deyildir. Çünki hərəkət etməyə, iş görməyə imkan verməməkdədir. İki əlin və ya iki ayağın kəsilməsi kimi. Belə olan bir şəxs, topluluğa xidmətdən aciz qalar.

**c.** Xəlifə olmağa qəti olaraq əngəldir, lakin xəlifəliyin davamına əngəl olmadığı ixtilaflı olan nöqsanlıqlar. Bu şəkildəki bir nöqsanlıqla,

---

Bu açıqlama da, yenə

• ibn Abbas'dan• Səid b. əl-Musəyyəb'dən; və• Dahhaq'dan rəvayət edilmişdir

Əbu Saleh isə, əbu Hureyrə (radiyallahu anh)›dan belə dediyini rəvayət etməkdədir

"Bütün Adəm oğulları, Allahın dilədiyi təqdirdə özlərinə əzab edəcəyi, yaxud mərhəmət edib bağışlayacağı bir günah ilə Allahın hüzuruna çıxarlar. Bundan tək istisna, Zəkəriyyə'nin oğlu Yəhya'dır. Çünki O, seyyid idi, hasur idi və salehlərdən olan bir peyğəmbər idi.

Daha sonra Allah rəsulu (sallallahu aleyhi və səlləm), əyilib əli ilə yerdən kiçik bir çöp aldı və belə dedi

"Onun fərci, bax bunun kimi idi, bu çöp kimi idi.

• «Hasur»un mənasının: "özünü, Allaha günah olan işlərdən uzaq tutan" olduğu da söylənilmişdir

**(İmam Qurtubi'nin, «əl-Cami li Əhkami›l-Quran" təfsirindən nəql)**

bəzi işlər, hərəkətlər edilə bilir; bəziləri isə, edilə bilmir. İki əldən və ya iki ayaqdan birinin olmaması kimi. Belə olan bir şəxs, orqan cəhətindən tam olmadığından xəlifə ola bilməz. Xəlifə ikən belə bir nöqsanlıq meydana gəlmişdirsə, bu mövzuda fəqihlər 2 qrupa ayrılmışlardır:

**aa.** Bir görüşə görə, xəlifə olmağa əngəl olan bir nöqsanlıq, onun davamına da əngəldir. Dolayısı ilə, xilafəti bitər.

**bb.** Bir görüşə görə də, xəlifə olmağa əngəl, lakin davamına əngəl deyildir. Xilafətin davamına mane olmaq üçün, tam bir nöqsanlıq gərəkdir. Halbuki bu hal, tam bir nöqsanlıq sayılmaz.

**d.** Xəlifəliyin davamına əngəl olmayan nöqsanlıqlar. (Ancaq bunun) Xəlifə olmağa əngəl olduğu xüsusunda ixtilaf vardır.

Gözlərdən birinin çıxması, burunun kəsilməsi kimi nöqsanlıqlardır. Bunların iş görməyə, yeriməyə bir təsiri yoxdur. Lakin pis və çirkin göstəricidir. Bu cür nöqsanlıqlar, xəlifəliyin qətiləşməsindən sonra olarsa, mane bir tərəfi yoxdur. Çünki ariz olan belə halların xilafət vəzifələrindən hər hansı birinə təsiri görülməməkdədir.

Xəlifə olmadan əvvəl, belə bir nöqsanlıq mövcuddursa, bunda 2 görüş vardır:

**1.** Bir görüşə görə: Xəlifə olmağa əngəl tərəfi yoxdur. Əsaslı şərtlərdən də sayılmaz.

**2.** Digər görüşə görə: Xəlifə olmağa əngəldir. Xəlifənin, hər cəhətdən mükəmməl olması lazımdır. Millətin işlərini idarə etməkdə bu cür nöqsanlıq, tənqidi, pislənməyi gərəkdirir, xəlifənin heybətli şəxsiyyətinə kölgə salar, əmrlərinə itaəti zəiflədər. Topluluğun haqlarına nöqsanlıqlar, zərərlər gətirər.

**N. Xəlifənin hüquqi təsərrüflərindəki nöqsanlıqlar**

**Xəlifənin təsərrüflərindəki nöqsanlıqlar:**

**a.** Hacir halı;

**b.** Quhrə halıdır.

**a. Hacir halı:** Xəlifənin idarəçilərindən, ən yüksək məmurlarından birinin, dövlət işlərini bir pislik, su-i istimal etmədən axsatmadan icra etməsidir.

Belə bir hal, xəlifənin xəlifəliyinə əngəl olmaz. Xəlifənin hüquqi təsərrüflərinin sihhəti, tənqid edilə bilməz. Yalnız işlərinə idarəçi təyin etdiyi şəxsin (halına) baxılar. Əgər dini hökmləri axsatmadan idarə edir, ədalətin gərəkdirdiyi şəkildə hərəkət edirsə, topluluq içində bir fəsadın, xarab nizamın yayılmaması, dini işlərin, muamələlərin durmaması üçün, xəlifənin bu işləri qəbulu, təsdiqi lazımdır, əsasən təsdiq edəcəyi də düşünülür. İşləri idarə üzərə təyin edilən şəxsin, dini hökmlərə, ədalətin gərəyinə tabe olmadığı görülərsə, xəlifənin digər iləri gələn məmurları, bunu əngəlləyər. Beləcə, o şəxsin təzyiqi, yalnış hərəkəti əngəllənər, ortadan qaldırılar.

**b. Quhrə isə:** Döyüşdə qalib gələn düşmən əlinə xəlifənin əsir düşməsi, qurtulmağa da imkan tapmamasıdır.

Əsir düşən, xəlifəliyə namizəddirsə, bu hal, xəlifə olmasına əngəldir. Əsir alan topluluq, istər müşrik, əhl-i hərb olsun, istərsə azğınlıq edən, daxili üsyan çıxaran Müsəlmanlar olsun, fərq etməz. Müsəlmanlar, onun xaricində birini xəlifə seçərlər.

Əgər xəlifə olduqdan sonra əsir düşmüşdürsə, o təqdirdə, hərblə və ya fidyə vermək surətilə onu qurtarmaq, Müsəlmanların vəzifəsidir. Şəxsin dövlət başçısı olması, bu köməyi gərəkdirir.

Əsir xəlifənin həyatından ümid kəsilərsə, əsir alanlarla (müşriklər və ya Müsəlmanların üsyan çıxaranları olsun), Müsəlmanların əleyhinə bir razılıq ola bilməz.

Xəlifə, əhl-i hərbin (müşriklərin) əlinə əsir düşər, hər cür səyə baxmayaraq əsarətdən qurtulması da ümidsiz olarsa, seçicilər heyəti bir başqasını xəlifə olaraq seçər və ona biət edərlər.

Əgər əsarətdə ikən, xilafət məqamına bir vəliəhd təyin etmişdirsə, vəliəhdi təyin halına baxılar. Əgər əsir düşmüş xəlifə, qurtulması imkansız bir halda ikən vəliəhd təyin etmişdirsə, bu təyin işi, batildir. Çünki xəlifəlikdən çıxdıqdan sonra, vəliəhd təyin etmiş deməkdir. Qurtulması ümid edilə bilən bir halda vəliəhd təyin etmişdirsə, hələ xilafət vəzifəsinin davam etdiyi qəbul edildiyindən, bu təsərrüfü mötəbərdir. Xəlifənin qurtulması sonradan ümidsizliyə düşərsə, vəliəhd xəlifə olar. Çünki ümidsizliklə, xəlifəliyi sonlanmışdır.

Xəlifə əsarətdə ikən, vəliəhd təyin etdikdən sonra əsarətdən qurtularsa, qurtuluşuna baxılar:

~ Əgər qurtulması ümid edilmədiyi andan etibarən keçən bir zaman içərisində qurtulmuşsa, xəlifəliyi qəbul edilməz. Çünki ümidsizliklə, bu vəzifədən çıxmışdır. Vəliəhd, xəlifə olar.

~ Əgər qurtulması ümidsizliyə düşmədən əvvəl olmuşdursa, xəlifəliyi davam edər.

Vəliəhd hər nə qədər xəlifə ola bilməsə də, vəliəhdliyi haqqındakı təyin işi, məqbulluğunu qoruyur.

Xəlifə, Müsəlmanların üsyankarlarına əsir düşmüş və əsirlikdən qurtulması da ümid edilirsə, xəlifəliyi davam edər. Qurtulması ümid edilmirsə, üsyankarlar, 2 haldan biri ilə baş-başadırlar: ya özlərinə bir xəlifə təyin edərlər və ya etməzlər. Hər nə qədər üsyan çıxarmış, xə-

lifəni tanımamışlarsa da, əsasən xəlifə öz əllərində əsirdir. Daha əvvəl, onun xilafətini tanımış, qəbul etmişlərdir. Bu cəhətdən, əsir xəlifəyə itaət etmək, özlərini bağlayıcıdır. Eynilə hacr altında olan xəlifənin, adil kimsələrin nəzarəti altında olması kimidir. Belə bir əsarət nəticəsində, seçicilər heyəti, işlərin idarəsi üçün bir naib seçərlər. Əgər əsir xəlifə, naibini təyin edə bilirsə, onun təyini, daha mötəbərdir. Əsir xəlifə əsirlikdən qurtular, yaxud ölərsə, naib xəlifə, xilafətdə israr edə bilməz. Çünki özü, mövcud olan bir xəlifəyə naib idi. O, ortaya çıxdığında və ya öldüyündə, naibliyi sonlanır.

Asilər özlərinə bir xəlifə seçər, ona tabe olarlarsa, əsir xəlifənin əsarətdən qurtulması da ümidsizdirsə, xəlifəliyi sonlanar. Çünki üsyankarlar, hökmləri və idarələri ayıran bir topluluq qurmuş, özlərinə tamamilə ayrı bir xəlifə təyin etməklə, başdakı xəlifəyə itaət etmədiklərini göstərmişlərdir. İtaətkar müsəlmanlar topluluğun, onlara köməyi ola bilməz. Onlar içərisində əsir olanın da, artıq idarəçilik qüdrəti yoxdur. Daru›l-adl (İslam ölkəsin)›dəki seçicilər topluluğu münasib gördükləri bir şəxsi xəlifə seçərlər. Bu muamələlərdən sonra, əsir xəlifə əsarətdən qurtularsa da, xəlifəliyi qəbul edilə bilməz. Çünki qurtulması, ümidsizliyə düşdüyü vaxtdan etibarən, xəlifəlikdən çıxmış sayılır.

**O. Xəlifənin mühim idarəçiləri**

Müsəlman topluluğun və işlərinin idarəsində, xəlifənin xəlifəlik hökmləri ümumi olaraq bildirilib görüşlər açıqlandıqdan sonra, onun idarə yönündən işlərini idarə edəcək olan məmurlara gəlincə:

**1.** Hər hansı bir səlahiyyət məhdudlaşdırması olmadan bütün işlərdə xəlifəyə naib olan vəzirlərdir. Bunlar, ümumi bir idarə səlahiyyətinə (vəlayət-i ammə) sahibdirlər.

**2.** Xüsusi işlərdə, ümumi, mütləq bir idarə səlahiyyətinə sahib olanlardır. Əyalətlərin, bölgə və diyarların valiləri (əmirləri) kimi. Görə-

cəkləri işlər və yerlər, müəyyən; və lakin o sahədə ümumi bir səlahiyyət və hərəkət sərbəstlikləri mövcuddur.

**3.** Ümumi işlərdə xüsusi idarə səlahiyyəti olanlardır. Baş qazı, ordu komandiri, sərhədi qoruyanlar, xərac və zəkat toplayanlar kimi. Bunlar, xüsusi bir idarə səlahiyyətini ehtiva edib o sahədə hər cür işi görə bilərlər.

**4.** Xüsusi işlərdə xüsusi idarə səlahiyyətləri olan idarəçilər topluluğudur. Bir ölkənin, bölgənin hakimi, xərac və zəkat toplayıcısı, sərhəd qoruyucusu, ordunun komandiri kimi. Bunlar, o mühitdə, ölkədə özlərinə aid sahələrdə idarə səlahiyyətləri daşıyırlar.

Bax bu 4 qrup idarəçilərin hər birinin də bəzi şərtləri mövcuddur. Şərtlər yerinə gəldiyində, idarəçi ola bilərlər.

**(İmam Mavərdi`dən olan izahlar burda bitir.)**

**Bu yazı, Demokratik rejimlərin dəstəklənməsi, seçkilərdə namizədlərə səs vermək, referendumlara qatılmaq, dövlət vəzifələrində işləmək və bənzəri nöqtələrlə əlaqəlidir.**

İbn Teymiyyə, belə deyir:

ومِن هذا البابِ تولِّي يوسفَ الصديقِ على خزائنِ الأرض لملِك مصرَ , بل ومسألتُه أن يجعَلَه على خزائنِ الأرض وكان هو وقومُه كفاراً كما قال تعالى : { وَلَقَدْ جَاءَكُمْ يُوسُفُ مِنْ قَبْلُ بِالْبَيِّنَاتِ فَمَا زِلْتُمْ فِي شَكٍّ مِمَّا جَاءَكُمْ بِهِ } , وقال تعالى عنه : { يَا صَاحِبَيِ السِّجْنِ أَأَرْبَابٌ مُتَفَرِّقُونَ خَيْرٌ أَمِ اللَّهُ الْوَاحِدُ الْقَهَّارُ } , { مَا تَعْبُدُونَ مِنْ دُونِهِ إِلَّا أَسْمَاءً سَمَّيْتُمُوهَا أَنْتُمْ وَآبَاؤُكُمْ } , ومعلومٌ أنه مع كفرِهم لا بدَّ أن يكونَ لهم عادةٌ وسُنةٌ في قبْض الأموال وصرْفها على حاشيةِ الملِك وأهلِ بيْته وجُنْدِه ورَعِيَّتِه , ولا تكون تلك جاريةً على سنةِ الأنبياءِ وعدْلهم , ولم يكن يوسف يُمكِنه أن يفعَلَ كلَّ ما يُريد

وهـو مـا يـراه مِـن ديـن الله , فـإنَّ القـومَ لـم يَسـتجيبوا له , لكـن فعَل الممكِـن مِن العدْل والإحسـانِ ونالَ بالسـلطان مِـن إكـرامِ المؤمنـينَ مِـن أهـلِ بيْتـه ما لـم يكـنْ يُمكِـن أنْ ينـالَه بـدونِ ذل

وهـذا كلـه داخـل في قـوله : { فَاتَّقُـوا اللَّهَ مَـا اسْـتَطَعْتُمْ } . فـإذا ازْدَحـم واجبـانِ لا يمكـن جمعُهمـا فقـدِّم أوْكدُهمـا لـم يكـن الآخَـرُ في هـذه الحـال واجبـاً , ولـم يكـن تاركـه لأجـلِ فعـلِ الأوْكـدِ تـاركَ واجـبٍ في الحقيقوكذلـك إذا اجتمَـع محرَّمـانِ لا يمكـن تـركُ أعظمِهما إلا بفعْـل أدناهما لـم يكـن فعـلُ الأدنى في هـذه الحـال محرَّمـاً في الحقيقـة وإن سـمِّي ذلـك تـركَ واجـبٍ , وسـمِّي هـذا فعـل محـرَّمٍ باعتبـار الإطـلاق لـم يـضُرَّ . ويقـال في مثـلِ هذاتـركُ الواجـب لعـذرٍ وفعـلُ المحـرَّم للمصلحـة الراجحـة أو للـضرورة ؛ أ ولدفعِ ما هو أحرم

*«Siddiq Yusufun – aleyhissalam – Misir məlikinin xəzinədarlğını öz öhdəsinə götürməsi bu babdandır. O hətta kraldan onu xəzinədarlığa təyin etməsini istəmişdi. Halbuki kral da, xalqı da kafir idilər. Necəki uca Allah buyurur:*

*«Daha öncədə Yusuf sizə açıq dəlillərlə gəlmişdi. O zamanda sizə gətirdiyindən şübhə içində idiniz.»*

*«Ey zindan yoldaşlarım! Çoxlu rəbblərmi xeyirlidir yoxsa tək Qahhar olan Allah?»*

*«Ondan başqa ibadət etdikləriniz sizin və atalarınızın verdiyi isimlərdən başqa bir şey deyil.»*

*Məlumdur ki, onlar kafir olduqları üçün, malların toplanmasında, kralın yaxınlarına, ailəsinə, ordusuna, rəiyyətinə xərclənməsində mütləq öz adətləri və qanun qaydaları vardı və bu xərcləmələr Nəbilərin yolu və ədaləti üzrə deyildi!*

*Lakin Yusufun hər istədiyini etməsi və Allahın dinindən gördüyü hər şeyi həyata keçirməsi mümkün deyildi. Çünki, xalq onun dəvətini qəbul etməmişdi. Ancaq ədalət və ihsan qismindən mümkün olan şeyləri edirdi.*

*Hakimiyyət vasitəsilə ailəsindən olan möminlərə elə ikramlar etdiki, hakimiyyətdə olmadan bunları etməsi mümkün deyildi.*

*Bütün bunlar uca Allahın bu ayəsinə daxildir: «Allahdan bacardığınız qədər qorxun.»*

*İki vacib cəm edilməsi imkansız şəkildə bir araya gələrsə, daha önəmli olan önə alınar və bu halda digər vacib vacib sayılmaz. Həmçinin daha önəmlini önə aldığı üçün ikinci/digər vacibi tərk edən, həqiqətdə vacibi tərk edən sayılmaz.*

*Eyni qaydada iki haram bir araya gələrsə və onlardan böyük olanın*

*tərki ancaq kiçik olanını etməklə mümkün olarsa, bu halda kiçik haramı işləmək - bu vacibin tərki adlansa belə - həqiqətdə haram olmaz.*

*Bu, ümumi olaraq haram felin edilməsi adlansa da zərəri olmaz. Bu kimi şeylər, üzr səbəbilə vacibin tərki və ya haramın racih məsləhət yada zərurət səbəbilə, yaxud da daha haram olan şeyin dəfi üçün işlənməsiadlanır.''*(1)

1 (Əhməd İbn Teymiyyə: Məcmuatul Fətəva: 20/34-35, Darul Vəfa: 1426/2005)

والنجــاشي مــا كان يَمكِنــه أن يحكُــم بحكــمِ القــرآن ؛ فــإنَّ قومَــه لا يقرُّونــه عــلى ذلــك ، وكثـيراً مــا يتــولَّى الرجــلُ بــين المســلمينَ والتتــارِ قاضيــاً بــل وإمامــا وفي نفسِــه أمــورٌ مِــن العــدْل يُريــد أن يعمَــل بهــا فــلا يُمكِنــه ذلــك ، بــل هنــاك مــن يمنَعــه ذلــك ، ولا يُكلّــف اللهُ نفْســاً إلا وسْــعَه وعمــر بــن عبــد العزيــز عُــودي وأُوذي عــلى بعــض مــا أقامــه مِــن العــدل وقيــل : إنــه سُــمَّ عــلى ذلفالنجــاشي وأمثــالُه سُــعَداءُ في الجنــة وإن كانــوا لــم يلتَزمــوا مِــن شرائــعِ الإســلام مــا لا يقــدِرون عــلى التِزامِــه بــل كانــوا يحكُمــون بالأحــكام الــتي يُمكنهــم الحكــمُ بــه

*“Nəcaşinin Quranla hökm etmə imkanı yox idi. Çünki, xalqı onun bunu etməsinə icazə vermirdi.*

*Bir çox halda insan Müsəlmanlar və Tatarlar arasında qazi, hətta idarəçi olur və qəlbində reallaşdırmaq istədiyi ədalətli işlər olduğu halda buna imkan tapa bilmir. Ona mane olan kimsələr var. Allah kimsəyə gücündən artıq heçnə yükləməz!*

*Ömər bin Abdil Aziz reallaşdırdığı ədalətli işlərə görə düşmənlik və əziyyət görmüş və bu səbəblə zəhərləndiyi qeyd edilir.*

*Nəcaşi və bənzərləri İslam Şəriətindən gücləri çatmayan şeylərə əməl etməyib, sadəcə reallaşdırılması mümkün olan əhkamlarla hökm verdiklərinə baxmayaraq Cənnətlikdirlər..."*[1]

فالواجبُ على المسلِم أن يجتهِد في ذلك بحسَب وُسْعِه ؛ فمَن ولِي ولايةً يقصِد بها طاعةَ الله ، وإقامةَ ما يمكِنُه مِن دينه ، ومصالحِ المسلمين، وأقامَ فيها ما يُمكِنه مِن الواجبات واجتنَب ما يمكِنه مِن المحرَّمات : لم يُؤاخَذ بما يعجِز عنه ، فإن توليةَ الأبْرار خيرٌ للأمة مِن توليةِ الفجَّاومَن كان عاجزاً عن إقامة الدين بالسُّلطان والجهاد ، ففعَل ما يقدِر عليه ، مِن النصِيحة بقلْبِه ، والدعاءِ للأمةِ ، ومحبةِ الخير ، وفعَل ما يقدِر عليه مِن الخير : لم يكلَّفْ ما يعجِز عن

*"Müsəlmana vacib olan, bu sahədə səy göstərməsidir. Kim Allaha itaəti, Dinindən və Müsəlmanların məsləhətlərindən gücü çatanı reallaşdırmağı qəsd etdiyi bir vəzifəyə gələr, bu vəzifədə gücü çatan vacibləri reallaşdırar, gücü çatan haramlardan çəkinərsə, gücü çatmayan şeylərdən sorğu sual olunmaz.*

*Çünki, yaxşıların vəzifədə olması Ümmət üçün facirlərin vəzifədə olmasından daha xeyirlidir.*

*Kim Dinin hakimiyyət və cihad yoluyla iqamə edilməsinsən aciz-*

---

1 (Əhməd İbn Teymiyyə: Məcmuatul Fətəva: 19/219, Mədinə: 1416/1995)

*dirsə, qəlbiylə yaxşılıqlarını diləmək, Ümmət üçün dua etmək, xeyri sevmək qəbilindən əməlləri və gücü çatan xeyirli işləri reallaşdırırsa, aciz olduğu şeylərdən mükəlləf deyil...”* (1)

مسألة : في رجلٍ متوّلِ ولاياتٍ ، ومُقطِع إقطاعات ، وعليها مِن الكُلَف السلطانيةِ ما جرَتْ به العادةُ ، وهو يختارُ أن يُسقِط الظلْم كلَّه ، ويجتهِد في ذلك بحسَب ما قدَر عليه ، وهو يعلَم أنه إن ترَك ذلك وأقطعَها غيرَه وولَّى غيرَه ، فإنَّ الظلمَ لا يترُك منه شيئا ، بل ربما يزْداد ، وهو يُمكِنه أن يُخفّف تلك المُكُوس التي في إقطاعه ، فيُسقِط النصْفَ ، والنصفُ الآخِر جهةُ مصارفَ لا يُمكنه إسقاطُه ، فإنه يُطلَب منه لتلكَ المصارِف عِوَضَها ، وهو عاجزٌ عن ذلك لا يُمكنه ردُّه

فهل يجوز لمثل هذا بَقاؤه على ولايتِه وإقطاعِه ، قد عُرِفت نيَّتُه واجتهادُه ، وما رفَعه مِن الظلم بحسَبِ إمكانه ، أم عليه أن يرفَع يدَه عن هذه الولايةِ والإقطاع

1 (Əhməd bin Teymiyyə: Əs Siyəsətus Şəriyyə: 133, Səudiyyə: 1418)

، وهو إذا رفَع يده لا يَزول الظلمُ ، بل يبقَى ويزْداد ، فهل يجوز له البقاءُ على الوِلايةِ والإقطاع كما ذُكِر؟ وهل عليه إثمٌ في هذا الفعل أم لا ؟ وإذا لم يكن عليه إثم فهل يُطالب على ذلك أم لا ؟ وأي الأمريْنِ خيرٌ له : أن يستمِرَّ مع اجتهاده في رفْعِ الظلمِ وتقليلِه ، أم رفْعُ يدِه مع بقاءِ الظلم وزيادةِ ؟ وإذا كانت الرَّعِية تختارُ بقاءَ يدِه لما لها في ذلك مِن المنفعة به ، ورفْعِ ما رفَعه مِن الظلم ، فهل الأولى له أن يُوافِق الرَّعية أم يرفَع يدَه ، والرعيةَ تَكرَه ذلك لعلْمِها أن الظلمَ يبقى ويزْداد برفْع يدِه

فأجاب: الحمد لله ، نعم إذا كان مجتهداً في العدْل ورفْعِ الظلم بحسَبِ إمكانه ووِلايته خيرٌ وأصلحُ للمسلمين مِن ولاية غيرِه واستِيلاؤُه على الإقطاع خيرٌ مِن استيلاءِ غيرِه كما قد ذُكِر : فإنه يجوز له البقاء على الوِلاية والإقطاع ولا إثمَ عليه في ذلك ؛ بل بقاؤُه على

ذلـك أفضـلُ مِـن ترْكِـه إذا لـم يشـتغِل إذا ترَكـه بمـا هـو أفضـلُ مـن

وقـد يكـون ذلـك عليـه واجبـاً إذا لـم يَقُـم بـه غـيرُه قـادراً عليـه . فنـشْرُ العـدل - بحسـب الإمـكان ورفْـع الظلـم بحسَـبِ الإمـكان - فـرضٌ عـلى الكفايـة يقـوم كلُّ إنسـانٍ بمـا يقـدِر عليـه مِـن ذلـك إذا لـم يَقُـمْ غـيرُه في ذلـك مقامَـه ولا يُطالـب والحالـة هـذه بمـا يعجِـز عنـه مِن رفْـع الظلومـا يقـرِّره الملـوكُ مِـن الوظائـفِ الـتي لا يُمكِنـه رفعُهـا لا يُطالَـب بهـا ، وإذا كانـوا هـم ونُوَّابهـم يطلَبـون أمـوالاً لا يُمكِـن دفعُهـا إلا بإقـرارِ بعـض تلـك الوظائـفِ وإذا لـم يدفَـعْ إليهـم أعْطـوا تلـكَ الإقطـاعاتِ والولايـةَ لمن يقـرِّر الظلـمَ أو يَزيـده ولا يخفِّفـه كان أخـذُ تلـكَ الوظائـف ودفعُهـا إليهـم خـيراً للمسـلمين مِـن إقرارِهـا كلّهوالمُقطـع الذي يفعَـل هـذا الخـيرَ يرفَـع عـن المسـلمِين مـا أمكنَـه مِن الظلـم ويدفَـع شرَّ الشّريـر بأخـذ بعـضِ مـا يُطلَـب منهـم

فما لا يُمكنه رفعُه هو محسن إلى المسلمين غيرُ ظالمٍ لهم يُثاب ولا إثمَ عليه فيما يأخُذه على ما ذكَره ولا ضَمَانَ عليه فيما أخَذه ولا إثمَ عليه في الدنيا والآخرة إذا كان مجتهداً في العدْل والإحسانِ بحسَبَ الإمكان

وهذا كوَصِي اليتيمِ وناظرِ الوقْف والعاملِ في المضارَبة والشريكِ وغيرِ هؤلاءِ ممن يتصرَّف لغيرِه بحكمِ الوِلاية أو الوكالةِ إذا كان لا يُمكِنه فعلُ مصلحَتِهم إلا بأداءِ بعضِه مِن أموالهم للقادر الظالم : فإنه محسنٌ في ذلك غيرُ مُسِي

والذي ينهَى عن ذلك لئلا يقَع ظلْمٌ قليلٌ لو قبِل الناس منه تضاعَف الظلمُ والفسادُ عليهم ، فهم بمنزلةِ مَن كانوا في طريقٍ وخرَج عليهم قُطاَّعُ الطريق ، فإنْ لم يرضَوهم ببعضِ المال أخَذوا أموالَهم وقتَلوهم ، فمن قال لتلك القافلة : لا يحِل لكم أن تُعْطُوا لهؤلاءِ شيئاً مِن الأموال التي معكم للناس ، فإنه

يقصِد بهذا حفْظَ ذلك القليل الذي ينهَى عن دفْعِه ، ولكن لو عمِلوا بما قال لهم ذهَب القليلُ والكثيرَ وسُلِبوا مع ذلك ، فهذا مما لا يُشير به عاقلٌ فضلاً أن تأتي به الشَّرائع ، فإن الله تعالى بعَث الرُّسُلَ لتحصيلِ المصالح وتكميلِها ، وتعطيلِ المفاسد وتقليلِها بحسب الإمكا

*"Sual: Bəzi vəzifələri və İqta koordinasiyasını öz üzərinə götürmüş, həmçinin bəzi hökümət vəzifələrindən məsul kimsə haqqında soruşuldu. Bu adam zülmü tamamən ortadan qaldırmaq istəyir, bunun üçün imkanları daxilində çalışır.*

*O bilir ki, əgər bu vəfizəni tərk etsə, iqta rəhbərliyinə və digər vəzifəyə başqasını qoysa, zülmdə heç bir azalma olmayacaq. Əksinə bəlkə artacaq. Lakin onun öz rəhbərlik etdiyi sahədə vergiləri azaltmaq, yarıya düşürmək imkanı var. Masraf qismi olan digər yarını isə ortadan qaldırmağa gücü çatmır. Bu masrafların qarşılığı ondan istənir və onun bunu rədd edəcək gücü yoxdur.*

*Belə birinin vəzifədə və iqta rəhbərliyində qalması caizdirmi? Onun niyyəti, çalışması, gücü çatdığı qədərilə zülmü ortadan qaldırması məlumdur. Yoxsa bütün bu vəzifələrdən istefa etməlidir? O istefa etsə zülm bitməyəcək. Qalacaq və bəlkə daha da artacaq.*

*Bu şərtlərdə onun qeyd edilən vəzifələrdə qalması caizdirmi? Buna görə günah qazanırmı? Əgər günah qazanmırsa buna görə sorğu sual*

*varmı?*

*Onun üçün bu iki variantdan hansı xeyirlidir: Zülmə mane olmaq, onu azaltmağa çalışmaqla bərabər vəzifədə qalmasımı, yoxsa zülmün qalıb daha da artacağına önəm verməyib istefa etməsimi?*

*Əgər xalq onda olan mənfəət və zülmə (qismən) mane olması səbəbilə vəzifədə qalmasını tələb edirsə, onun xalqa qulaq verməsi dahamı uyğundur? Yoxsa istefamı etsin? Xalq onun istefasıyla zülmün qalacağımı hətta artacağını bildiyi üçün buna razı deyil.*

*Cavab: Allaha həmd olsun. Bəli! Əgər deyildiyi kimi, ədaləti təmin etmək və zülmü aradan qaldırmaq üçün imkanları daxilində çalışırsa və onun vəzifədə olması müsəlmanlar üçün daha xeyirli və uyğundursa, onun İqta rəhbəri olması başqasının olmasından daha xeyirlidirsə, onun vəzifədə və İqta rəhbərliyində qalması caizdir və bu halda heç bir günah daşımır!*

*Hətta, əgər daha xeyirli bir işlə məşğul deyilsə bu vəzifədə qalması, istefa etməsindən daha xeyirlidir. Bəzən bu işi görə biləcək başqa adam olmadığı zaman bu onun üzərinə vacib olar.*

*İmkan daxilində ədaləti bərqərar edib, zülmü ortadan qaldırmaq kifayi fərzdir. Əgər başqası bu işi yerinə yetirmirsə hər insan bu sahədə əlindən gələni etməlidir. Bu halda aradan qaldırmağa gücü çatmadığı zülmlərdən sorğu sual olunmaz.*

*Hökmdarın təyin etdiyi vergilərdən mane olmağa gücü çatmayan şeylər səbəbilə sorğu sual olunmaz. Əgər onlar və köməkçiləri yalnız bu vergilərdən bir qisminin verilməsilə ödənə biləcək mallar tələb edirlərsə və əgər bu malları ödəməsə bu İqtaları və vəzifələri zülmü daha da yerləşdirəcək və ya artıracaq, heç bir şəkildə azaltmayacaq kimsəyə verəcəklərsə, bu (haqsız) vergilərin alınıb yuxarı ötürülməsi*

*müsəlmanlar üçün hamısını ödəməkdən daha xeyirlidir...*

*... Bu işi reallaşdıran vəzifə sahibi, ondan tələb edilənlərin bir qismini toplayıb ödəməklə gücü nisbətində müsəlmanlara edilən zülmü ortadan qaldırır, daha şiddətli zərəri dəf edir.*

*Gücü çatmayan şeylərdə də o, müsəlmanlara yaxşılıq edir, onlara zülm etmiş sayılmaz. Savab qazanar. Zikr edilən şəraitdə aldığı (yuxarı ötürdüyü) mallar üçün günah qazanmaz. Aldığı malları (daha sonra əsl sahiblərinə geri) ödəməsi tələb edilə bilməz. İmkanları daxilində ədalət və yaxşılığa çalışdığı zaman nə Dünyada, nə də Axirətdə günahkar deyil.*

*Belə birisi yetim vəsisi, vəqf nəzarətçisi, mudarəbədə (ortaqlıqda) işçi və ya şərik kimi, vilayət və ya vəkalət yoluyla başqası adına iş görənə bənzəyir. İşini öhdəyə götürdüyü kimsələrin məsləhətini ancaq zalıma onların malından bir miqdar verməklə reallaşdıra bilirsə, bu halda o pislik yox, yaxşılıq edən kimsədir. (Bu minalda davam etdikdən sonra misal verərək deyir)*

*... İnsanlara az zülm edilməsin deyə bunu qadağan edən kimsənin bu fikri qəbul edilərsə, zülm və fəsad qat qat çoxalar. Bunu qadağan edənin halı aşağıdakı kimidir: Yola çıxırlar və quldurlar yollarını kəsir. Əgər quldurlara malın bir qismini verib razı salmasalar, onlar həm yolçuları öldürəcək, həm də mallarının hamısını götürəcəklər.*

*Bir kimsə karvandakılara "Quldurlara sizə tapşırılmış mallardan bir şey verməniz halal deyil" deyərsə, o bununla verilməsinə mane olduğu az malın qorunmasını qəsd etmişdir. Lakin, əgər karvan əhli onun sözünə uyğun davransa, malın azıda çoxuda gedəcək, tam soyulacaqlar.*

*Belə bir şeyi nəinki Şəriətlər, heç normal bir ağıl sahibi əmr etməz! Çünki uca Allah Peyğəmbərləri imkan daxilində məsləhətlərin təmini,*

*təkmili və məfsədətlərin aradan qaldırılması və azaldılması üçün göndərib. (Fətva bu minvalla deyilənlərin təkrarları qeyd edilərək davam edir).''*[1]

ومنها : أن اللهَ يدفَع عن المؤمنينَ بأسبابٍ كثيرةٍ قد يعلَمون بعضَها وقد لا يعلَمون شيئاً منها ، وربما دفَع عنهم بسببِ قبِيلتِهم أو أهلِ وطَنِهم الكفارِ كما دفَع الله عن شُعَيبٍ رجْمَ قومِه بسببِ رَهْطِه وأن هذه الروابِطَ التي يحصُل بها الدفْعُ عن الإسلام والمسلمِين لا بأس بالسعْي فيها ، بل ربما تعيَّن ذلك ، لأن الإصلاحَ مطلوبٌ على حسَبِ القُدْرة والإمْكان فعلى هذا لو ساعدَ المسلمُون الذين تحتَ ولايةِ الكفار وعمِلوا على جعلِ الولايةِ جمهوريةً يتمَكَّن فيها الأفرادُ والشُّعوبُ مِن حقوقِهم الدّينية والدنيوية لكان أولى مِن استسْلامهم لدولةٍ تَقضِي على حقوقِهم الدينية والدنيوية وتحرِص على إبادتِها وجعْلِهم عمَلَةً وخَدَمًا لهم نعم إن أمكنَ أن تكون الدولةُ للمسلِمين وهم الحكامُ فهو المتعيَّن ، ولكن لعدمِ إمكان هذه المرْتبة فالمرْتبة التي فيها دفعٌ ووقايةٌ للدين والدنيا مقدَّمةٌ والله أعلم

---

1 (Əhməd İbn Teymiyyə: Məcmuatul Fətəva: 20/34-35, Darul Vəfa: 1426/2005)

*“Ayədən çıxan faydalar: Uca Allah möminləri müxtəlif vasitələrlə qoruyar. Möminlər bu vasitələrdən bəzisini bilir, bəzisini isə bilmirlər. Bəzən onları qəbilələri və ya kafir həmvətənləri vasitəsilə qoruyar. Necəki, uca Allah Şuaybı qohumları vasitəsilə daşqalaq edilməkdən qorumuşdu.*

*İslam və Müsəlmanların qorunmasını təmin edən bu vasitələri istifadə etməkdə bir bəis/problem yoxdur. Hətta bəzən bu vacib olar. Çünki, islah etmək güc və imkanlar nisbətində tələb edilir.*

*Bundan dolayı, əgər kafirlərin hakimiyyəti altında olan müsəlmanlar yardımlaşar və dövlətin Dini və Dünyəvi - fərdi, sosyal hüquqlarının təmin edildiyi (Demokratik) Respublika sisteminə çevrilməsi üçün çalışarlarsa, bu onlar üçün Dini və Dünyəvi hüquqlarını ortadan qaldıran, o hüquqları məhv etməyə, onları kölə və xidmətçilərə çevirməyə çalışan bir dövlətə (Diktaturaya) təslim olmalarından daha uyğundur/yaxşıdır.*

*Bəli! Dövlətin müsəlmanlara aid olması, onların hakim olması mümkündürsə bunu reallaşdırmaq vacibdir! Lakin bu mərtəbəni (İslam dövlətini) əldə etmək mümkün olmadıqda, (zərərlərin) dəf edildiyi, Din və Dünyanın (qismən) qorunduğu (Demokratik) mərtəbə öncəliklidir. Allah daha gözəl bilir.”*[1]

* * *

1 (Abdur Rahman Əs Sadi: Təysirul Kərimir Rəhman: 2/448, Riyad: Darus Səlam: 1422/20)

# İkinci Məktub

**«Ben çok hasta olduğum ve siyasetle alâkasız bulunduğum halde, Adnan Menderes gibi bir İslâm kahramanı ile bir sohbet etmek isterdim. Hal ve vaziyetim görüşmeye müsaade etmediği için, o surî** (zahiri) **konuşmak yerine, bu mektup benim bedelime konuşsun diye yazdım.**

**Gayet kısa birkaç esası, İslâmiyetin bir kahramanı olan Adnan Menderes gibi dindarlara beyan ediyorum.**

**Birincisi: İslâmiyetin pek çok kanun-u esasîsinden** (əsas qanunlarından) **birisi,**

وَلاَ تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى **âyet-i kerîmesinin hakikatıdır ki,**

**'Birisinin cinayetiyle başkaları, akraba ve dostları mesul olamaz.'**

**Halbuki, şimdiki siyaset-i hâzırada** (indiki siyasətdə), **particilik taraftarlığıyla, bir câninin** (cinayətkar) **yüzünden, pek çok mâsumların zararına rıza gösteriliyor. Bir câninin** (cinayətkarın) **cinayeti yüzünden, taraftarları veyahut akrabaları dahi şenî** (pis, çirkin) **gıybetler ve tezyifler** (təhqirlər) **edilip, birtek cinayet, yüz cinayete çevrildiğinden, gayet dehşetli bir kin ve adaveti damarlara dokundurup kin ve garaza ve mukabele-i bilmisile** (mislilə qarşılıq verməyə) **mecbur ediliyor. Bu ise, hayat-ı içtimaiyeyi** (ictimai həyatı), **tamamen zîr ü zeber** (alt-üst) **eden bir zehirdir. Ve hariçteki düşmanların parmak karıştırmalarına tam bir zemin hazırlamaktır. İran ve Mısır'daki hissedilen hadise ve buhranlar** (böhranlar), **bu**

**esastan ileri geldiği anlaşılıyor. Fakat onlar, burası gibi değil; bize nisbeten pek hafif, yüzde bir nisbetindedir. Allah etmesin, bu hal bizde olsa, pek dehşetli olur.**

**Bu tehlikeye karşı çare-i yegâne** (yeganə çarə)**:**

**Uhuvvet-i İslâmiyeyi** (İslam qardaşlığını) **ve esas İslâmiyet milliyetini, o kuvvetin temel taşı yapıp, mâsumları himaye için, cânilerin** (cinayətkarların) **cinayetlerini, kendilerine münhasır bırakmak lâzımdır.**

**Hem, emniyetin ve âsâyişin temel taşı, yine bu kanun-u esâsîden** (əsas qanundan) **geliyor.**

**Meselâ, bir hanede veya bir gemide bir mâsum ile on câni** (cinayətkar) **bulunsa, hakikî adaletle ve emniyet ve âsâyiş düstur-u esasîsi** (əsas düsturu) **ile, o mâsumu kurtarıp tehlikeye atmamak için, gemiye ve haneye ilişmemek lâzım—tâ ki, mâsum çıkıncaya kadar…**

**İşte bu kanun-u esasî-i Kur›ânî** (Quranın bu əsas qanununun) **hükmünce, âsâyiş ve emniyet-i dahiliyeye** (daxili əmin-amanlığa) **ilişmek, on câni** (cinayətkar) **yüzünden doksan mâsumu tehlikeye atmak, gazab-ı İlâhînin** (Allahın qəzəbinin) **celbine vesile olur.**

**Madem Cenâb-ı Hak, bu tehlikeli zamanda, bir kısım hakikî dindarların başa geçmesine yol açmış, Kur'ân-ı Hakîmin bu kanun-u esasîsini** (hikmətli Quranın bu əsas qanununu) **kendilerine bir nokta-i istinad** (istinad nöqtəsi) **ve onlara garazkârlık edenlere karşı siper yapmak lâzım geldiğini, zaman ihtar ediyor** (bizə xatırladır)**.**

**İslâmiyetin ikinci bir kanun-u esasîsi** (əsas qanunu)**: Şu hadîs-i şeriftir:**

سَــيِّدُ الْقَــوْمِ خَادِمُهُــمْ *'Qövmünün ağası, onlara xidmət edəndir.'* **hakikatiyle, memuriyet, bir hizmetkârlıktır; bir hâkimiyet ve benlik için tahakküm** (təzyiq altına almaq, despotluq etmək) **âleti değil...**

**Bu zamanda terbiye-i İslâmiyenin** (İslam tərbiyyəsinin) **noksaniyetiyle; ve ubudiyetin** (qulluğun) **zafiyetiyle, benlik, enaniyet kuvvet bulmuş. Memuriyeti hizmetkârlıktan çıkarıp bir hâkimiyet ve müstebidâne** (istibdadvari) **bir tahakküm ve mütekebbirane** (təkəbbürlü) **bir mertebe tarzına getirdiğinden, abdestsiz, kıblesiz namaz kılmak gibi, adalet, adalet olmaz, esasiyle de bozulur. Ve hukuk-u ibad** (qulların haqları) **da, zîr ü zeber** (alt-üst) **olur. Hukuk-u ibad** (qulların haqları)**, hukukullah** (Allahın haqları) **hükmüne geçmiyor ki, hak olabilsin. Belki nefsanî haksızlıklara vesile olur.**

**Şimdi, Adnan Menderes gibi, ‹İslâmiyetin ve dînin icaplarını yerine getireceğiz› diye ve mezkûr** (yuxarıda zikr edilən) **iki kanun-u esasîye** (əsas qanuna) **karşı muhalefet edip tam zıddına olarak iki dehşetli cereyan, gayet büyük rüşvetle halkları aldatmak ve ecnebîlerin müdahalesine yol açmak vaziyetinde hücum etmek ihtimali, kuvvetlidir.**

• **Birisi: Birinci kanun-u esasîye** (əsas qanuna) **muhalif olarak, bir câni** (cinayətkar) **yüzünden, kırk mâsumu kesmiş, bir köyü de yakmış. Bu derecede bir istibdad-ı mutlak** (despotluq)**, her nefsin zevkine geçecek memuriyete bir hâkimiyet suretinde rüşvet vererek, dindar hürriyetperverlere hücum ediliyor.**

• **İkinci hücum da: İslâmiyet milliyet-i kudsiyesini** (qüdsi milliyyətini) **bırakıp, evvelkisi gibi, bir câni** (cinayətkar) **yüzünden, yüz mâsumun hakkını çiğneyebilen, zahiren bir milliyetçilik ve hakikatte ırkçılık damarıyla, hem hürriyetperver dindar Demokratla-**

**ra, hem bütün bu vatandaki yüzde yetmişi sair unsurlardan bulunanlara, hem hükûmet aleyhine, hem biçare Türkler aleyhine, hem Demokratın takip ettiği siyaset aleyhine çalışarak ve serseri ve enaniyetli nefislere gayet zevkli bir rüşvet olarak, bir ırkçılık kardeşliği veriyor. O zevkli kardeşliğin içinde, o zevkli fâideden bin defa daha ziyade hakikî kardeşleri düşmanlığa çevirmek gibi acip tehlikeyi, o sarhoşluğu ile hissedemiyor.**

**Meselâ, İslâmiyet milliyetiyle dört yüz milyon hakikî kardeşin hergün** اَللّٰهُمَّ اغْفِرْ لِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ *(‘Allahım, mömin qadın və kişiləri bağışla.’)* **dua-yı umumîsiyle** (ümumi duası ilə) **mânevî yardım görmek yerine, ırkçılık dört yüz milyon mübarek kardeşleri, dört yüz serseriye ve lâübalilere** (biveclərə)**, yalnız dünyevî ve pek cüz’î bir menfaati için terk ettiriyor. Bu tehlike, hem bu vatana, hem hükûmete, hem de dindar Demokratlara ve Türklere, büyük bir tehlikedir. Ve öyle yapanlar da, hakikî Türk değillerdir. Necip Türkler, böyle hatâdan çekinirler.**

**Bu iki taife, herşeyden istifadeye çalışıp dindar Demokratları devirmeye çalıştıkları ve çalıştırıldıkları, meydandaki âsar** (əsərləri) **ile tahakkuk ediyor** (özünü göstərir)**. Bu acip tahribata ve bu iki kuvvetli muarızlara** (müxaliflərə) **karşı, kırk Sahabe ile dünyanın kırk devletine karşı meydan-ı muarazaya** (mübarizə meydanına) **çıkan ve galebe eden ve bin dört yüz sene zarfında ve her asırda üç yüz dört yüz milyon şakirdi bulunan hakikat-i Kur›âniyenin** (Quran həqiqətlərinin) **sarsılmaz kuvvetine dayanmak ve onun içindeki dünyevî ve uhrevî** (axirətə aid) **saâdet-i ebediyenin** (əbədi səadətin) **zevklerine o câzibedar hakikatle beraber nokta-i istinad yapmak** (istinad nöqtəsi qılmaq)**, o mezkûr muarızlarınıza** (o

yuxarıda zikr edilən müxaliflərinizə) **ve hem dahil ve hariçteki düşmanlarınıza karşı en lâzım ve elzem** (daha çox lazım) **ve zarurî bir çâre-i yegânedir** (yeganə çarədir)**. Yoksa, o insafsız dahilî ve haricî düşmanlarınız, sizin bir cinayetinizi binler yapıp ve eskilerin de cinayetlerini ilâve ederek, başkaların başına yükledikleri gibi, size de yükleyecekler. Hem size, hem vatana, hem millete telâfi edilmeyecek** (düzəldilə bilməyəcək) **bir tehlike olur.**

**Cenâb-ı Hak, sizleri, İslamiyyet lehindeki hizmetlerinizde muvaffak ve mezkûr** (yuxarıda zikr edilən) **tehlikelerden muhafaza eylesin diye, ben ve Nurcu kardeşlerimiz, yapacağınız hizmete ve mezkûr hakikati kabul etmenize mukabil dua etmeye karar vereceğiz.**

**Üçüncüsü: İslâmiyetin hayat-ı içtimaiyeye** (ictimai həyata) **dair bir kanun-u esasîsi** (əsas qanunu) **dahi, bu hadis-i şerifin,** اَلْمُؤْمِنُ لِلْمُؤْمِنِ كَالْبُنْيَانِ الْمَرْصُوصِ يَشُدُّ بَعْضُهُ بَعْضًا **hakikatıdır. Yani, hariçteki düşmanların tecavüzlerine karşı, dahildeki adâveti unutmak ve tam tesanüd etmektir. Hattâ en bedevî tâifeler dahi, bu kanun-u esasînin** (əsas qanunun) **menfaatini anlamışlar ki, hariçte bir düşman çıktığı vakit, o taife birbirinin babasını, kardeşini öldürdükleri halde, o dahildeki düşmanlığı unutup, hariçteki düşman def oluncaya kadar tesanüd ettikleri halde; binler teessüflerle deriz ki, benlikten, hodfuruşluktan** (eqoistlikdən)**, gururdan ve gaddar siyasetten gelen dahildeki tarafgirane fikriyle, kendi tarafına şeytan yardım etse, rahmet okutacak; muhalifine melek yardım etse, lânet edecek gibi hâdisâtlar** (hadisələr) **görünüyor. Hattâ, bir sâlih âlim, fikr-i siyasîsine** (siyasi fikrinə) **muhalif bir büyük sâlih âlimi tekfir derecesinde gıybet ettiği; ve İslâmiyet**

**aleyhinde bir zındığı, onun fikrine uygun ve taraftar olduğu için hararetle senâ ettiğini** (tərifləşdiyini) **gördüm. Ve şeytandan kaçar gibi, otuz beş seneden beri siyaseti terkettim.**

**Hem şimdi birisi, hem Ramazan-ı Şerife, hem şeâir-i İslâmiyeye** (İslam şüarlarına)**, hem bu dindar millete büyük bir cinayeti yaptığı vakit, muhaliflerinin, onun o vaziyeti hoşlarına gittiği görüldü. Halbuki, küfre rıza küfür olduğu gibi; dalâlete, fıska, zulme rıza da fısktır, zulümdür, dalâlettir.**

**Bu acip halin sırrını gördüm ki, kendilerini millet nazarında ettikleri cinayetlerinden mâzur** (üzrlü) **göstermek damarıyla muhaliflerini kendilerinden daha dinsiz, daha câni** (cinayətkar) **görmek ve göstermek istiyorlar. İşte bu çeşit dehşetli haksızlıkların neticeleri pek tehlikeli olduğu gibi, içtimaî ahlâkı da zîr ü zeber** (alt-üst) **edip bu vatan ve millete ve hâkimiyet-i İslâmiyeye** (İslam hakimiyyətinə) **büyük bir suikast hükmündedir.**

**Daha yazacaktım, fakat bu üç nokta-i esasiyeyi** (əsas nöqtəni)**, şimdilik dindar hürriyetperverlere beyan etmekle iktifa ediyorum** (kifayətlənirəm)**."**[1]

**"Adnan Menderes'e gönderilmek niyetiyle evvelce yazılan içtimaî hayatımıza ait bir hakikatın haşiyesini takdim ediyoruz.**

**Hâşiye: Eskilerin lüzumsuz keyfî kanunları ve su-i istimalleri neticesinde, belki de tahrikleriyle zuhur eden Ticanî meselesini, dindar Demokratlara yüklememek ve âlem-i İslâmın** (İslam aləminin) **nazarında Demokratları düşürmemenin çare-i yegânesi** (yeganə çarəsi)**, kendimce böyle düşünüyorum:**

---

1 (Emirdağ Lahikası - ll, 102-ci Məktub, s. 152) cümləsilə, Adnan Menderes'ə, məna olaraq belə deyir)

**Ezan-ı Muhammedînin (a.s.m.) neşriyle, Demokratlar on derece kuvvet bulduğu gibi; Ayasofya'yı, beş yüz sene devam eden vaziyet-i kudsiyesine** (qüdsi vəziyyətinə) **çevirmek ve halen İslâmda çok hüsn-ü tesir yapan** (çox gözəl təsir buraxan) **ve bu vatan ahalisine âlem-i İslâmın** (İslam aləminin) **hüsn-ü teveccühünü** (gözəl təvəccühünü) **kazandıran, yirmi sekiz sene mahkemelerin muzır** (zərərli) **cihetini bulamadıkları ve beş mahkeme de beraatine karar verdikleri Risale-i Nur'un resmen serbestîsini, dindar Demokratlar ilân etmeli ve bu yaraya bir nevi merhem vurmalıdırlar. O vakit âlem-i İslâmın** (İslam aləminin) **teveccühünü kazandıkları gibi, başkalarının zâlimane kabahatları onlara yüklenmez fikrindeyim. Dindar Demokratlar, hususan Adnan Menderes gibi zatların hatırları için, otuz beş seneden beri terk ettiğim siyasete bir-iki saat baktım ve bunuyazdım."**[1]

..........................................................................

## Şərhi:

**(Ben çok hasta olduğum ve siyasetle alâkasız bulunduğum halde, Adnan Menderes gibi bir İslâm kahramanı ile bir sohbet etmek isterdim. Hal ve vaziyetim görüşmeye müsaade etmediği için, o surî konuşmak yerine, bu mektup benim bedelime konuşsun diye yazdım.)**

Ustad Said Nursi (rahmətullahi aleyh), həyatının böyük bir qismində, "اَعُـوذُ بِـاللهِ مِـنَ الشَّـيْطَانِ وَالسِّيَاسَـةِ / Şeytandan və siyasətdən Allaha sığınıram." düsturu ilə əməl etmiş və bunu tələbələrinə də əmr etmiş və ömrünün sonuna qədər heç bir siyasi partiya ilə əlaqədar olmamışdır. Ustadın, mətndə keçən ***"siyasetle alakasız bulunduğum***

1 (Emirdağ Lahikası - ll, 103-cü Məktub, s. 153)

***halde”*** ifadəsi; və siyasətdən uzaq olduğuna dair sair bəyanatları, bizə bunu bildirməkdədir. Ancaq O, Quran naminə, Adnan Menderes’ə bəzi tövsiyyələr vermiş və İlahi əmri, Quran naminə onlara təbliğ etmişdir. Bunlar:

**1.** İslam həqiqətləri və Allahın haqları olan bütün İlahi əhkamı həyatın bütün sahələrinə, xüsusən elmi, əməli və ədəbi sahələrə yerləşdirmək;

**2.** Mənfi milliyyəti qaldırmaq və dövlətə, irqçiliyi ifadə etməyən və bütün Müsəlmanları qucaqlayacaq İslami bir isim vermək və digər irqlərə də haqlarını vermək surətilə ədaləti təmin etmək;

**3.** Partiyaçılıq zehniyyətini dövlətdə hakim qılmamaq;

**4.** Ayasofya məscidini açmaq;

**5.** İman və Quran həqiqətlərini dərs verən Risale-i Nuru, rəsmi şəkildə sərbəst etmək və tədris yerlərinə daxil etmək;

**6.** Dövləti Quranın əhkamına istinad etdirərək, daxili və xarici düşmənlərə qələbə çalmaq.

Ustad Nursi*, “Kırk Sahabe ile dünyanın kırk devletine karşı meydan-ı muarazaya (mübarizə meydanına) çıkan ve galebe eden ve bin dört yüz sene zarfında ve her asırda üç yüz dört yüz milyon şakirdi bulunan hakikat-i Kur’âniyenin (Quran həqiqətlərinin) sarsılmaz kuvvetine dayanmak”*[1] cümləsilə, Adnan Menderes’ə, məna olaraq belə deyir:

*“40 səhabə, Qurana istinad etdiyi üçün, 40 dövləti məğlub etmişdir. Sən də, 400 millət vəkilinlə Qurana istinad etsən, daxili və xarici düşmənlərinə qələbə çalarsan.”*

---

1 (Emirdağ Lahikası - ll, 102-ci Məktub, s. 152)

Ustad Nursi, Quranın dəllalı olması səbəbilə, Adnan Menderesə bu tövsiyyələri vermişdir. Bu və bənzəri məktublar, -əsla və əsla, Demokrat Partiyası'nı mədh etmək mənasında deyildir və bunun üçün yazılmamışlardır. Ustadın, partiyaçılıq, siyasət və demokratiya ilə heç bir əlaqəsi yoxdur. Ancaq doğrudan-doğruya İlahi əhkamı həyatın hər sahəsində hakim qılmaq üçün, Demokratlara yuxarıdakı tövsiyyələri vermişdir.

**(Gayet kısa birkaç esası, İslâmiyetin bir kahramanı olan Adnan Menderes gibi dindarlara beyan ediyorum.)**

***"İslam kahramanı"*** təbirində keçən ***"İslam"*** kəliməsi, lüğətdə ***"təslim olmaq"*** mənasındadır. Burda isə, lüğət mənası murad deyildir. Əksinə, Ustadın ***"Mektubat"***[1] və ***Barla Lahikası'***nda[2] tərif etdiyi məna muraddır. Yəni, şəri əhkama tamamilə tərəfdar olub o əhkamı həyatın hər sahəsində icra etmək mənasında istifadə edilmişdir. ***«Kahraman»*** kəliməsi isə, ***«düşmənindən qorxmayan adam»*** deməkdir.

O halda, Ustadın, ***«İslam kahramanı»*** təbirindən muradı, İlahi əhkamı həyatın hər sahəsində hakim qılan və bu xüsusda düşmənlərindən qorxmayan və çəkinməyən kimsə deməkdir. Lakin Ustadın məktublarından da anlaşılacağı üzərə, o (Adnan Menderes), daxili və xarici düşmənlərindən qorxaraq rəqiblərinin istəyinə görə hərəkət etdi, İlahi hökmləri tətbiq etmək surətilə Qurana tərziyə vermədi (Quranı razı salmadı) və qorxdu.

Ustad Nursi (rahmətullahi aleyh), ***«İslam kahramanı»*** təbirini, daha əvvəl də zikr etdiyimiz kimi, bir təşviq və təmənni üçün istifadə etmişdir.

**(Birincisi: İslâmiyetin pek çok kanun-u esasîsinden [əsas qa-**

1 (9-cu Məktub, s. 31)

2 (271-ci Məktub, s. 307-308)

**nunlarından] birisi,** وَلاَ تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى âyet**-i kerîmesinin hakikatıdır ki, 'Birisinin cinayetiyle başkaları, akraba ve dostları mesul olamaz.' Halbuki, şimdiki siyaset-i hâzırada** [indiki siyasətdə]**, particilik taraftarlığıyla, bir câninin** [cinayətkar] **yüzünden, pek çok mâsumların zararına rıza gösteriliyor. Bir câninin** [cinayətkarın] **cinayeti yüzünden, taraftarları veyahut akrabaları dahi şenî** [pis, çirkin] **gıybetler ve tezyifler** [təhqirlər] **edilip, birtek cinayet, yüz cinayete çevrildiğinden, gayet dehşetli bir kin ve adaveti damarlara dokundurup kin ve garaza ve mukabele-i bilmisile** [mislilə qarşılıq verməyə] **mecbur ediliyor. Bu ise, hayat-ı içtimaiyeyi** [ictimai həyatı]**, tamamen zîr ü zeber** [alt-üst] **eden bir zehirdir. Ve hariçteki düşmanların parmak karıştırmalarına tam bir zemin hazırlamaktır.)** Xaricdəki düşmənlər, yəni, o gizli əcnəbi dinsiz komitə, partiyaçılıq vasitəsilə Müsəlmanları bir-birilərilə boğuşdurur və bununla, Müsəlmanları zəiflədib küfrünü yerləşdirir. **(İran ve Mısır'daki hissedilen hadise ve buhranlar** [böhranlar]**, bu esastan ileri geldiği anlaşılıyor. Fakat onlar, burası gibi değil; bize nisbeten pek hafif, yüzde bir nisbetindedir. Allah etmesin, bu hal bizde olsa, pek dehşetli olur.**

**Bu tehlikeye karşı çare-i yegâne)**, partiyaçılığı və türkçülüyü deyil; **Uhuvvet-i İslâmiyeyi** [İslam qardaşlığını] **ve esas İslâmiyet milliyetini, o kuvvetin)** yəni dövlətin **(temel taşı yapıp,)** həyatın hər sahəsində İlahi əhkamı hakim qılıb **(masumları himaye için, canilerin cinayetlerini kendilerine münhasır bırakmak lazımdır.)**

Yəni, hansı partiyadan və hansı partiya mənsublarından zərər gəlmişdirsə, yalnız onları məsul tutmaq lazımdır. Onların cinayətlərindən dolayı, başqalarına ədavət və zülm etmək, وَلاَ تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى

/ *"Heç bir günahkar başqasın*ın günahını daşımaz.»[1] ayətinin nassı ilə haramdır. Halbuki, partiyaçılıq sistemində ədalətlə muamələ etmək, mümkün deyildir. Çünki hansı partiya iqtidara gəlirsə, başqalarını əzməyə çalışır.

Diqqət edilsə, görülür ki, Ustad, bu məktubu ilə, -əsla- Adnan Menderes'in partiyasını dəstəkləmək deyil; əksinə, Adnan Menderes'ə, partiyaçılığı tərk etməsini, İslam qardaşlığını təsis etməsini və İslam milliyyətini əsas tutmasını tövsiyyə edir. Çünki dində, partiyaçılıq yoxdur. Partiyaçılıq təfriqəyə səbəb olur, İslam qardaşlığını məhv edir. Bu partiyaçılıq illəti və irqçilik xəstəliyi, Müsəlmanları parçalamaq və yox etmək üçün əcnəbilər tərəfindən içimizə atılmışdır. Ustad Nursi (rahmətullahi aleyh), bu məktubunda, bütün siyasətlərdən bəri olaraq, sadəcə:

~ İslam qardaşlığını əmr edən إِنَّمَا ٱلْمُؤْمِنُونَ إِخْوَةٌ / *"Möminlər, yalnız qardaşdırlar."*[2] ayətini; və

~ İlahi ədaləti təmin edən وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَىٰ / *"Heç bir günahkar başqasının günah yükünü daşımaz."*[3] ayətini tövsiyyə edir.

Onları həm partiyaçılıqdan, həm də irqçilikdən qurtarmaq üçün, Quranın əhkamına dəvət edir. Həm ölkənin təhlükəsizliyi, həm də dünya və axirət səadəti üçün, belə bir tövsiyyə edir, İlahi hökmləri onlara təbliğ edir.

Ustad Nursi (rahmətullahi aleyh), Türkiyədə çox partiyalı sistemə keçildiyi vaxt, partiyaçılığın oyandırdığı fitnəyə qarşı, ***"Uhuvvet Risalesi"*** adlı əsərini qələmə almış və dində partiyaçılığın olmadığını, açıq-

---

1 (İsra/15)

2 (Hucurat/10)

3 (Fatir/18)

ca isbat etmişdir. Dində partiyaçılığın olmadığı; Ustadın, partiyaçılığı və bu günki siyasəti dəstəkləmədiyi; və Onun, Adnan Menderesə məzkur (yuxarıda zikr edilən) tövsiyyələri, məktublarında açıq bir şəkildə bildirilmişkən, fasid təvillərlə Onun Demokrat Partiyası'nı dəstəklədiyini iddia etmək, əziz Ustadımıza böyük bir böhtandır.

Necə ki, ədalətin təmini, zülm və haqsızlıqların ortadan qalxması, bu birinci əsas qanundan qaynaqlanır. **(Hem)** də **(emniyyetin ve asayişin temel taşı, yine bu kanun-i esasiden geliyor.)** Partiyaçılıq və irqçilik səbəbilə bir-birilərinə qarşı düşmən vəziyyəti alan kimsələr, asayişi də pozarlar. Halbuki, وَلَا تَـــزِرُ وَازِرَةٌ وِزْرَ اُخْـــرٰى / *"Heç bir günahkar başqasının günah yükünü daşımaz."*[1] əsas qanunu ilə, əmin-amanlıq və asayiş; ancaq Quranın hakimiyyəti vasitəsilə, İslam qardaşlığının təsis edilməsi, İslam milliyyətinin əsas tutulması, partiyaçılıq və mənfi milliyyətçiliyə son verilməsilə təmin edilə bilər.

**(Meselâ, bir hanede veya bir gemide bir mâsum ile on câni** [cinayətkar] **bulunsa, hakikî adaletle ve emniyet ve âsâyiş düstur-u esasîsi** [əsas düsturu] **ile, o mâsumu kurtarıp tehlikeye atmamak için, gemiye ve haneye ilişmemek lâzım—tâ ki, mâsum çıkıncaya kadar…**

**İşte bu kanun-u esasî-i Kur›ânî** [Quranın bu əsas qanununun] **hükmünce, âsâyiş ve emniyet-i dahiliyeye** [daxili əmin-amanlığa] **ilişmek, on câni** [cinayətkar] **yüzünden doksan mâsumu tehlikeye atmak, gazab-ı İlâhînin** [Allahın qəzəbinin] **celbine vesile olur.)**

Ustad Nursi, Adnan Menderes'ə xitabən, mücməl olaraq belə deyir:

*"Cumhuriyyət Xalq Partiyası və Millət Partiyası, bəşəri qanunlara və türkçülüyə istinad etdi, tərəfgirlik səbəbilə öz partiyalarından olmayanları təhlükəyə atdılar, zülm etdilər. Sən, bunlar kimi etmə! On-*

1 (Zümər/7)

*lar, 1 cinayətkar üçün, 100 məsumu fəda edərlər, bəzən də bir kəndi yandırarlar. Sən, 100 cinayətkar üçün olsa belə, 1 məsumu fəda etmə! Quranın,* أَلَّا تَـزِرُ وَازِرَةٌ وِزْرَ أُخْـرَىٰ *"Heç bir günahkar başqasının günah yükünü daşımaz."*[1] *düsturu ilə hərəkət etmək surətilə, həqiqi ədaləti təmin et! Yəni, digər partiyalar, öz tərəfdarlarının mənfəətlərini güdürlər və ya öz irqlərinə tərəfdarlıq edirlər; sən, belə etmə. Partiyaçılığı və irqçiliyi burax, İlahi əhkamı icra et, İslam milliyyətinə istinad et, hər haqq sahibinə haqqını ver, beləcə ədalətli davran! Bu icraatın, həm ədaləti, həm də əmin-amanlıq və asayişi təmin edər. Həm də sizləri, İlahi qəzəbdən qurtarar. Əks təqdirdə, xarici güclər, partiyaçılığı və irqçiliyi əldə tutub bununla Müsəlmanları boğuşduracaq və özləri də buna tamaşaçı olacaqlardır."*

Necə ki, Ustad Nursi, gələcək cümlələrində bunu ifadə etməkdədir:

**(Madem Cenâb-ı Hak, bu tehlikeli zamanda, bir kısım hakikî dindarların başa geçmesine yol açmış, Kur'ân-ı Hakîmin bu kanun-u esasîsini** [hikmətli Quranın bu əsas qanununu] **kendilerine bir nokta-i istinad** [istinad nöqtəsi] **ve onlara garazkârlık edenlere karşı siper yapmak lâzım geldiğini, zaman ihtar ediyor** [bizə xatırladır]**.)**

Ustad, «**Cenâb-ı Hak, bu tehlikeli zamanda, bir kısım hakikî dindarların başa geçmesine yol açmış**» cümləsilə deyir ki:

*"Sizin iqtidara gəlməyiniz, Allahın bir nemətidir. Bu nemət, şükür istəyir. Bu nemətin şükrü isə, həyatın hər sahəsində, İlahi əhkamı tətbiq və icra etməkdir. Əks təqdirdə, şükürdən şirkə düşülmüş olar. Bu İlahi nemətə qarşı şükür olaraq, İslam həqiqətlərini hakim qılsanız, həm Allahı razı etmiş olarsınız, həm millət qurtular, həm də sizlər qurtulmuş olarsınız. Əgər digərləri kimi bu nemətə şükr etməyib su-i*

1 (Nəcm/38)

*istimal etsəniz, yəni İlahi əhkamın həyatın hər sahəsində hakim olması üçün çalışmazsanız, həm Allahın qəzəbini, həm də diyarın fəlakətinə səbəb olarsınız.”*

Və elə də oldu. Başda Adnan Menderes olmaq üzərə, Demokrat Partiyası mənsubları, bu nöqtədə Ustadı dinləmədikləri üçün, “partiyaçılıq” - sağ-sol cərəyanlarını; “irqçilik” isə - türkçülük və kürdçülük məsələlərini nəticə verdi. Bu cərəyanlar səbəbilə, ölkədə əmin-amanlıq və asayiş pozuldu, minlərlə insan, can və malını itirdi.

Ustad Nursi (rahmətullahi aleyh), Adnan Menderes’dən, İslamın birinci əsas qanununda 2 şey istəyir:

**1.** İslam dinində partiyaçılıq yoxdur. Çünki partiyaçılıq, qruplaşmağa və hər partiyanın, öz tərəfdarlarına tərəfdarlıq göstərib, digərlərinə qarşı olmasına səbəbdir. → Bu isə, ümmət arasında təfriqəyə yol açır. → Təfriqəyə yol açdığı üçün də, haramdır. Bu səbəblə, partiyaçılığı tərk et!

**2.** İrqçilik damarı ilə qruplaşmaq da, Quranın nassı ilə qadağan olunduğundan, dövləti mənfi milliyyətçilikdən qurtarmaq və dövlətə bütün Müsəlmanları qucaqlayacaq bir ad vermək lazımdır. Çünki Xalq Partiyası, partiyaçılıq və irqçiliklə, hədsiz cinayət işlədi. Sən də partiyaçılığı və irqçiliyi əsas məqsəd qılsan, hədsiz cinayət işləmiş olarsan.

İndi biz, insaf əhlindən soruşuruq:

Ustadın bu cümlələrində, zərrə qədər siyasəti dəstəklədiyini və ya Demokrat Partiyası lehində danışdığını göstərən hər hansı bir işarət vardırmı? Əsla və əsla.

Ancaq Ustad (rahmətullahi aleyh), Allahın əmrini və Müsəlmanların mənfəətinə olan xüsusları, Demokrat Partiyası mənsublarına təbliğ etmişdir. Ustad, İlahi əhkamın tətbiqini onlardan istəmişkən, Ustadın

vəfatından sonra batil təvillərlə Müsəlmanları qruplaşdırmaq və partiyaçılığı məşru göstərmək üçün, bəzi kimsələr, Ustadı, Demokrat Partiyasını və demokratiyanı dəstəkləmiş kimi göstərmişdir.

Halbuki Ustadın siyasətlə və partiyaçılıqla heç bir əlaqəsi yoxdur. Ancaq o partiyada qismən Müsəlmanların olması səbəbilə, Demokratları, İlahi əhkamın tətbiqilə Quranın ədalətini təmin etməyə dəvət etmişdir. Ustad, yalnız Demokratlara deyil, iqtidarda olan bütün idarəçilərə də bu təbliği etmişdir. O halda, Ustadı Demokrat Partiyası tərəfdarı kimi göstərmək, Ona böyük bir böhtandır.

**(İslâmiyetin ikinci bir kanun-u esasîsi: Şu hadîs-i şeriftir:** سَيِّدُ الْقَوْمِ خَادِمُهُمْ *‘Qövmünün ağası, onlara xidmət edəndir.›* **hakikatiyle, memuriyet, bir hizmetkârlıktır)**

Məmurluq, hərfi mənası ilə bir xidmətçilikdir. Yəni, *“Amir”* (əmr edən) və *“Hakim”* (hökm edən), yalnız Allahdır. İdarəçi isə, Allahın əmrlərini yerinə yetirən bir məmurdur. Məmur isə, İlahi qanunların və o qanunlara boyun əyən Müsəlmanların xidmətçisidir **(bir hakimiyyet ve benlik için tahakküm aleti değil.)** Yəni, o məmurluq, fironlaşıb, qanunlar pərdəsi altında xalqa zülm etmək deyildir. Əksinə, məmurluq Allahın qanunlarını qullarına ədalətlə icra etmək üçün verilən bir vəzifədir. Dolayısı ilə, məmurluq, həm İlahi əhkama, həm də o əhkamı qəbul edənlərə xidmətçilikdir.

**(Bu zamanda terbiye-i İslamiyyenin noksaniyyetiyle ve ubudiyyetin zafiyyetiyle,)** yəni bu zamanda bəşəriyyət, məsciddə Allaha ibadət etməkdən üz çevirdiyi kimi; həyatın hər sahəsində İlahi əhkamı hakim qılmamaqla, bir növ ubudiyyət/qulluq zəncirini boynundan çıxarmış olur. Yəni, başda idarəçilər olmaq üzərə, əksər insanlar, həyatın hər sahəsində İlahi əhkama istinad etmir, Allahın hökmü ilə hökm

etmirlər; mediada İslam əleyhinə hər şey yayılır, əxlaq dərindən-dərinə yaralanır. Bəşər, şəxsi, idari, hüquqi və ictimai sahələrdə qulluğa yaraşan bir davranış sərgiləmədiyi, əksinə istədiyi kimi hərəkət etdiyi üçün **(benlik, enaniyyet kuvvet bulmuş. Memuriyyeti, hizmetkarlıktan çıkarıp, bir hakimiyyet ve müstebidane bir tahakküm ve mütekebbirane bir mertebe tarzına getirdiğinden;)** nəticəsi mənfi olur.

Ustad Nursi (rahmətullahi aleyh), belə deyir:

*"Felsefenin halis bir tilmizi (şagirdi), bir firavundur. Fakat menfaati için en hasis şeye ibadet eden bir firavun-u zelildir (zəlil bir firondur)...*

*...Amma hikmet-i Kur'ân'ın (Quran hikmətinin) halis tilmizi (şagirdi) ise, bir abddir (quldur). Fakat âzam-ı mahlûkata (ən böyük məxluqa) da ibadete tenezzül etmez. Hem Cennet gibi âzam-ı menfaat (mənfəəti ən böyük) olan bir şeyi, gaye-i ibadet (ibadət məqsədi) kabul etmez bir abd-i azizdir (izzətli bir quldur)."*[1]

Ustadın bu ifadələrinə görə, əməli fəlsəfəni rəhbər edən bir idarəçi, firon kimi özünü müstəqil görür, özünü o diyarın həqiqi amiri və hakimi imiş kimi təsəvvür etdiyindən, qanun çıxarır, çıxardığı o qanunları icra edir, o qanunlara itaət etməyənləri də cəzalandırır. Özünü, Allahın *"Amir"* və *"Hakim"* isimlərinin təcəllisinə mazhar və Onun hökmlərini təbliğ və tətbiq etməklə mükəlləf bir məmur surətində görmür. Quranın şagirdi isə, özünü qul bilir, İlahi əhkama boyun əyir, yalnız Xaliqin rizasını əsas məqsəd qılır.

Demək, qanunlar, Quranın ədaləti hesabına və Allah naminə icra olunmazsa, ədalət təmin edilməz; əksinə zülm edilmiş olar; **(abdestsiz, kıblesiz namaz kılmak gibi, adalet olmaz; esasiyle de bozulur ve hukuk-u ibad** [qulların hüquqları] **da zir'ü-zeber** [alt-üst] **olur.)**

1 (Sözlər, 12-ci Söz, 2-ci əsas, s. 127)

Ustad Nursi (rahmətullahi aleyh), **(Hukuk-u ibad, hukukullah hükmüne geçemiyor ki, hak olabilsin;)** ifadəsilə, Demokratlaya deyir ki:

*"Siz, əgər Allah hesabına İlahi əhkamı tətbiq etsəniz, həm Allahın, həm də qulların haqlarına **(Haşiyə-1)** riayət etmiş olarsınız. Ancaq siz, İlahi əhkama istinad etmədən, öz iradənizlə çıxarmış olduğunuz hökmləri öz hesabınıza tətbiq etsəniz; zahirən xalqa faydalı kimi görünsə də, nəticədə yenə şər və zülm olar. Çünki həm hökmlər, İlahi deyildir; həm də bu hökmlər, Allah naminə icra olunmur. Dəstəmazsız namazın bir faydası olmayacağı kimi, bu şəkildə qanun çıxarmaq da, fayda təmin etməz.*

*O halda, qulların haqları, Allahın haqlarını ehtiva etməlidir. Fərz edək ki, siz, qulların haqlarına riayət etsəniz belə, Allah üçün olmadığı üçün, yenə zülm etmiş olarsınız.*

*Demək, hüququ, "Allahın əmri budur." deyə tətbiq etmək məcburiyyətindəsiniz."**(Haşiyə-2)***

Ustad, bu cümlələri ilə belə demək istəyir:

*Quranın ədaləti, həm Allahın haqlarını, həm də qulların haqlarını ehtiva edir. Qulların haqları, Allahın haqlarına, yəni Qurana istinad etməzsə, zülm olar.*

O halda, hər bir hökmün icrasında, 2 hüquq vardır:

**1.** Allahın haqqı;

**2.** Qulların haqları.

Əgər qulların haqları, Allahın haqlarını ehtiva etməzsə, yəni Allahın haqlarına istinad etməzsə və Allah naminə olmazsa, böyük zülm olar.

---

**(Haşiyə-1)** Bu məktubun sonunda, bu kimi məfhumların izahları gələcəkdir.

**(Haşiyə-2)** Bu məktubun sonunda, bu kimi məfhumların izahları gələcəkdir.)

Məsələn:

Bir adam, oğurluq etdi. Məzlumun haqqını almaq üçün bu oğurluq cəzasına, əlbəttə bir cəza veriləcəkdir. Bu cəza, Allahın haqqını ehtiva etməzsə, yəni:

**a.** Allahın hökmünə görə olmazsa;

**b.** Allah hesabına icra olunmazsa,

ədalət deyil, zülm edilmiş olar. Çünki o günahda, Allahın haqqı da vardır. O haqq da, ancaq Allahın əmr etdiyi tərzdə o cəzanın tətbiq edilməsidir. Hakim, *"Allahın əmri budur."* deyib, sonra o cəzanı tətbiq edəcəkdir.

Necə ki, bir insan, namazın bütün şərtlərini yerinə yetirsə, lakin dəstəmaz almazsa; və ya namazın bütün rükünlərini yerinə yetirsə, lakin qibləyə dönməzsə, namazı səhih olmaz.

Eynilə bu misal kimi, qulların haqları, Allahın haqlarını ehtiva etməzsə, ədalət təmin edilməz, nəticəsi də zülm olar. Çünki hakim, özünü müstəqil təsəvvür edir; özünü İlahi əhkamın bir xidmətçisi olaraq görmür. İdarəçi və hakim, qulların haqlarını icra edərkən, İlahi əhkam ilə deyil, öz qərarı ilə hökm etdiyi vaxt, haqq və ədaləti təmin edə bilməz.

Ustad Said Nursi (rahmətullahi aleyh), belə deyir:

*"Demek, hakikî adalet ve tesirli ceza odur ki, Allah'ın emri namıyla olsun. Yoksa tesiri yüzden bire iner."*[1]

**(belki nefsani haksızlıklara vesile olur.)**

Demək ki, cəzalar, həm Allahın hökmünə görə, həm də Allah hesabına olmalıdır. Yoxsa, ədalətli olmağı düşünərkən, zülm edilmiş olar.

---

1 ("Hutbe-i Şamiyye", s. 45)

*"Hakim"* və *"Adil"* isimləri, Allahın isimlərindəndir. Allahın Zatında şəriki olmadığı kimi, isimlərində də şəriki yoxdur. Bu səbəblə, elmi, əməli və ədəbi sahələr, hər zaman və hər yerdə, *"Hakim"* və *"Adil"* isimlərinin təcəllilərinə ayna olmalıdırlar. Bu isə, ancaq İlahi əhkamın tətbiq və icrası ilə mümkündür. Əks təqdirdə, Ustadın ifadəsilə, nəmrudluq, fironluq edilmiş olar. *"Hakim"* və *"Adil"* olan Allah Taala, bu 2 isminin müqtəzası (gərəyi) ilə, bizə mənən belə deyir:

*"Hakim və Adil, yalnız Mənəm. Məndən qeyri hər şey, ədalətim qarşısında məhkumdur. Yəni, kainatdakı fitri qanunların hakimi Mən olduğum kimi; sizin felləriniz, qövlləriniz və hallarınızın da hakimi Mənəm. Əməli, elmi və ədəbi sahələrdə, insanların ictimai həyatlarını tənzim edəcək qanunların hakimi, Məndən qeyri yoxdur."*

Adəm (əleyhissəlam)'dan qiyamətə qədər, haqq dinin hökmü budur. O halda, həm idarəçi, həm də rəiyyət, bu 2 ismə ayna olmalıdırlar. Ta ki, bu 2 isimdə Allaha şərik qoşulmasın.

Demək, idarəçi, İlahi əhkamı icra və tətbiq etməklə; rəiyyət də, bu əhkama boyun əyməklə mükəlləfdir. Beləcə, həm idarəçi, həm də rəiyyət, Allaha qarşı məhkum olduqlarını ortaya qoymaqla, həqiqi hürriyyəti əldə etmiş olarlar və ancaq bununla insanlar bir-birilərinə qul olmaqdan qurtularlar.

Məmurluq, سَيِّدُ الْقَوْمِ خَادِمُهُمْ *'Qövmünün ağası, onlara xidmət edəndir.'*[1] hədisinin də bildirdiyi kimi, Allah naminə, İlahi əhkamı qullara təbliğ və o əhkamı icra etmək surətilə Allahın qullarına xidmətçilikdir. Yoxsa təşri haqqını öz üzərinə alıb və (qanun qoymaq) sifətini

1 (Mişkatu"l-Məsabih", hədis no: 3925, imam Muhamməd, "Şərhu"s-Siyəri"l-Kəbir", 1, 29)

istifadə etməyə çalışanların hər biri, Ustadın ifadəsilə, bir nəmrud, bir firon kimi; onlara itaət edənlər də, onların qulları kimi olurlar.

Bəli, firon, çıxarmış olduğu qanunlara xalqı dəvət etməklə və xalqın da onun çıxarmış olduğu qanunlara itaət etməsilə, öz rübubiyyət və uluhiyyətini ortaya qoymuşdur. İmam Fəxrəddin ər-Razi'nin bəyanına görə Firon, Allahın Zatını inkar etmirdi. Əksinə, rububiyyət və uluhiyyət sifətində Allaha şərik qoşurdu.

İslam hüququna görə, dini əhkam (yəni Allahın əmr və qadağaları), 4 bölmədə ələ alınmaqdadır:

**1.** İbadətlər;

**2.** Muamələt (alış-veriş kimi);

**3.** Münakəhat (evlənmək-boşanmaq kimi);

**4.** Uqubat (cəza hüququ)

İslam dövlətinin tətbiq və icra etməklə mükəlləf olduğu hər bir İlahi hökm içində, 2 haqq vardır:

**1.** Huququllah (Allahın haqları);

**2.** Huququ'l-ibad (qulların haqları).

İslam dövləti, hər 2 haqqı yerinə yetirməklə mükəlləfdir. Ədalət isə, ancaq İlahi əhkam ilə təmin edilə bilər. Ədalət kəliməsi, əksəriyyətlə, hüquqla bağlı əhkamda istifadə edilir. Yəni, *"ədalət"*, hüququllaha haqqı ilə riayət etməklə bərabər huququ'l-ibada da riayət etməkdir. Buna görə, Quranın ədaləti, Allahın haqlarına riayəti əmr etməklə bərabər, qulların haqlarına da riayəti əmr edir. Başqasının hüququna təcavüz etməz, hər haqq sahibinə haqqını verər, haqsızları da cəzalandırar. Heç kimə zülm etməz, hər kəsin haqqına riayət edər. Məsələn, adam öldürmək, zina, yol kəsmək, faiz, namaz qılmamaq, zəkat verməmək

